# AZƏRBAYCAN MƏKTƏBİ

## Elmi-nəzəri, pedaqoji jurnal

**2017**
**№ 6 (682)**
*(noyabr-dekabr)*

**1924-cü ildən çıxır**

*Azərbaycan Respublikası Təhsil Nazirliyinin 5 may 1996-cı il tarixli Nizamnaməsi ilə təsdiq olunmuşdur. Ədliyyə Nazirliyi üzrə dövlət qeydiyyatı № 11/3165*

*Redaksiyanın ünvanı:*
*Az1065, Bakı şəhəri,*
*Yasamal rayonu, Azad Mirzəyev küç., 236*

*Telefon/Faks*
*(012) 538-82-65*
*(012) 538-82-67*

*E-mail:*
*azarbaycan.maktabijurnali.24@mail.ru*

*Rekvizitlər:*
*Kapital Bankın Gənclik Filialı*
*h/h AZ83AIIB45810013441800004118*
*VÖEN: 9900003611*
*Bankın rekvizitləri:*
*Kod: 200189*
*m/hAZ37NABZ01350100000000001944*
*SWIFT: Bik AIIBAZ2X*

*Jurnal redaksiyada yığılıb səhifələnmiş, ARTİ-nin Təhsil Texnologiyaları Mərkəzində çap olunmuşdur.*

**Təsisçi**
**Azərbaycan Respublikası Təhsil Nazirliyi**

**BU NÖMRƏDƏ**

**LİSENZİYA № 022589**

**Jurnal Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir.**

**Jurnal akademik Mehdi Mehdizadə mükafatı laureatı adına layiq görülmüşdür.**

**Redaksiyanın əlaqə telefonları: 538-82-65; 538-82-67**

**Redaksiyanın ünvanı: Bakı şəhəri, Yasamal rayonu, Azad Mirzəyev küç., 236. İndeks AZ 1065 Kağız formatı 70x108 1/16 Sifariş: 09**

---

**Jurnal redaksiyanın kompüter mərkəzində yığılıb səhifələnmiş, ARTİ-nin Təhsil Texnologiyaları Mərkəzində çap olunmuşdur.**

**В этом номере**



**In this number**

# AZƏRBAYCAN RESPUBLİKASININ DÖVLƏT DİL KOMİSSİYASININ YENİ TƏRKİBİNİN TƏSDİQ EDİLMƏSİ HAQQINDA AZƏRBAYCAN RESPUBLİKASI PREZİDENTİNİN SƏRƏNCAMI

Qədim tarixi keçmişin izlərini özündə yaşadan və milyonlarla azərbaycanlının ünsiyyət vasitəsi olan Azərbaycan dili xalqımızın misilsiz mənəvi sərvəti, milli varlığımızın və dövlət müstəqilliyimizin başlıca rəmzlərindəndir. Ən dərin fikirləri ən incə çalarlarınadək ifadə qüdrətinə malik dilimiz öz kamilliyi və zənginliyinə görə dünya dilləri içərisində layiqli yerini bu gün də qoruyub saxlayır.

Azərbaycan dilinin dövlət dili olaraq qorunması və işləkliyinin təmin edilməsi müstəqil dövlət quruculuğunun prioritet prinsipləri sırasındadır. Ötən illər ərzində Azərbaycan dilinin rəsmi statusunun təminatı və tətbiqinin təkmilləşdirilməsinə dair müxtəlif qanun, fərman və sərəncamlar təsdiq edilmişdir. Dövlət dilinin həyatın hər bir sahəsində qeyd-şərtsiz işləkliyinin genişləndirilməsini və saflığının qorunmasını nəzərdə tutan bu sənədlər ölkədə dövlət dilinin tətbiqinin normativ hüquqi əsaslarını və icra mexanizmini tam müəyyən etmişdir. Bütün bunlar Azərbaycan dilinə məhz dövlətçiliyin əsas atributlarından biri kimi yanaşmanın bariz nümunəsi, dövlətin yüksək diqqət və qayğısının aydın təzahürüdür. Atılan addımlar ədəbi dilin daha da zənginləşməsi və tətbiq dairəsinin genişlənməsi baxımından son dərəcə əhəmiyyətli olmuşdur.

Eyni zamanda, qloballaşma proseslərinin geniş vüsət aldığı müasir dövrdə texnoloji yeniliklərin insanlar tərəfindən sürətlə mənimsənilməsi və maneəsiz informasiya mübadiləsi imkanlarının artması ana dilinin potensial imkanlarından lazımınca istifadəsində bəzi çətinliklər yaratmaqdadır. Mövcud şərait milli ideya – azərbaycançılıq məfkurəsi işığında dövlət dilinin saflığının qorunması və ədəbi dildən düzgün istifadə məsələlərinin daim diqqət mərkəzində saxlanılmasını zəruri edir. Bu istiqamətdə həyata keçiriləcək fəaliyyətin ardıcıllığının tənzimlənməsini və Azərbaycan dilinin işlənmə imkanlarının daha da genişləndirilməsini təmin etmək məqsədilə Azərbaycan Respublikası Konstitusiya-sının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq **qərara alıram:**

1. Azərbaycan Respublikasının Dövlət Dil Komissiyası aşağıdakı yeni tərkibdə təsdiq edilsin:

**Komissiyanın sədri**

İlham Əliyev – Azərbaycan Respublikasının Prezidenti

**Komissiya sədrinin müavinləri**

Mehriban Əliyeva – Azərbaycan Respublikasının Birinci vitse-prezidenti

Ramiz Mehdiyev – Azərbaycan Respublikası Prezidentinin Administrasiyasının rəhbəri

Akif Əlizadə – AMEA-nın prezidenti

Anar Rzayev – Azərbaycan Yazıçılar Birliyinin sədri

**Komissiyanın üzvləri**

Vasif Talıbov – Naxçıvan Muxtar Respublikası Ali Məclisinin sədri, Azərbaycan Respublikası Milli Məclisinin deputatı

Elçin Əfəndiyev – Azərbaycan Respublikası Baş nazirinin müavini

Hacıbala Abutalıbov – Bakı şəhər İcra Hakimiyyətinin başçısı

Mikayıl Cabbarov – Azərbaycan Respublikasının təhsil naziri

Əbülfəs Qarayev – Azərbaycan Respublikasının mədəniyyət və turizm naziri

Əli Həsənov – Azərbaycan Respublikası Prezidentinin İctimai-siyasi məsələlər üzrə köməkçisi – şöbə müdiri

İsa Həbibbəyli – AMEA-nın vitse-prezidenti, AMEA Nizami Gəncəvi adına Ədəbiyyat İnstitutunun direktoru, Azərbaycan Respublikası Milli Məclisinin Təhsil komitəsinin sədri, AMEA-nın həqiqi üzvü

Rafael Hüseynov – Nizami Gəncəvi adına Milli Azərbaycan Ədəbiyyatı Muzeyinin direktoru, Azərbaycan Respublikası Milli Məclisinin Mədəniyyət komitəsinin sədri, AMEA-nın həqiqi üzvü

Kamal Abdullayev – Azərbaycan Dillər Universitetinin rektoru, AMEA-nın həqiqi üzvü

Nizami Cəfərov – Azərbaycanda Atatürk Mərkəzinin müdiri, Azərbaycan Respublikası Milli Məclisinin deputatı, AMEA-nın həqiqi üzvü

Vasim Məmmədəliyev – Bakı Dövlət Universitetinin İlahiyyat fakültəsinin dekanı, AMEA-nın həqiqi üzvü

Teymur Kərimli – AMEA Humanitar Elmlər Bölməsinin akademik-katibi, AMEA-nın Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunun direktoru, AMEA-nın həqiqi üzvü

Möhsün Nağısoylu – AMEA-nın Nəsimi adına Dilçilik İnstitutunun direktoru, AMEA-nın həqiqi üzvü

Muxtar İmanov – AMEA-nın Folklor İnstitutunun direktoru, AMEA-nın həqiqi üzvü

Əbülfəz Quliyev – AMEA Naxçıvan Bölməsinin İncəsənət, Dil və Ədəbiyyat İnstitutunun direktoru, AMEA-nın müxbir üzvü

Arif Alışanov – “Azərbaycan Televiziya və Radio Verilişləri” Qapalı Səhmdar Cəmiyyətinin sədri

Mövlud Süleymanlı – xalq yazıçısı

Sabir Rüstəmxanlı – xalq şairi

Adil Babayev – Azərbaycan Dillər Universitetinin kafedra müdiri, professor

Mübariz Yusifov – Gəncə Dövlət Universitetinin filologiya fakültəsinin dekanı, professor

Elbrus Əzizov – Bakı Dövlət Universitetinin professoru

Buludxan Xəlilov – Azərbaycan Dövlət Pedaqoji Universitetinin professoru

Aydın Ələkbərov – filologiya elmləri doktoru, professor

İsmayıl Məmmədov – AMEA-nın Nəsimi adına Dilçilik İnstitutunun şöbə müdiri, filologiya elmləri doktoru, professor

Sayalı Sadıqova – AMEA-nın Nəsimi adına Dilçilik İnstitutunun şöbə müdiri, filologiya elmləri doktoru, professor

Afaq Vəliyeva – Tərcümə Mərkəzinin direktoru

Əflatun Amaşov – Azərbaycan Mətbuat Şurasının sədri, Azərbaycan Respublikası Milli Məclisinin deputatı

Aydın İbadov – Azərbaycan Respublikasının Dövlət Reklam Agentliyinin direktoru

2. Azərbaycan Milli Elmlər Akademiyası aidiyyəti qurumlarla birlikdə Azərbaycan dilinin saflığının qorunması və dövlət dilindən istifadənin daha da yaxşılaşdırılması ilə bağlı tədbirlər planını üç ay müddətində hazırlayıb Azərbaycan Respublikasının Prezidentinə təqdim etsin.

3. “Azərbaycan Respublikası Dövlət Dil Komissiyasının tərkibinin təsdiq edilməsi haqqında” Azərbaycan Respublikası Prezidentinin 2001-ci il 4 iyul tarixli 766 nömrəli Sərəncamı (Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2001, №7, maddə 500; 2006, №9, maddə 743) ləğv edilsin.

**İlham Əliyev**
***Azərbaycan Respublikasının Prezidenti***

**Bakı şəhəri, 13 noyabr 2017-ci il**



# FƏDAKAR ALİM, ZİYALI PEDAQOQ

**Əyyub Əzizov,**
***Bakı Dövlət Universitetinin professoru, Azərbaycan respublikasının əməkdar müəllimi***

**Firuzə Nadir,**
***Azərbaycan Jurnalistlər Birliyinin üzvü***



Məqalədə akademik Vaqif Abbasovun həyat yolundan bəhs edilmişdir. O adi kiçik elmi işçidən, institutun direktoru səviyyəsinə yüksəlmişdir. Vaqif Abbasovun əməyi dövlətimiz tərəfindən layiqincə qiymətləndirilmişdir. O, Respublikanın əməkdar müəllimidir. 9 dərsliyin müəllifidir.

***Açar sözlər:*** *akademik, məhsuldar alim, elmi məsləhətçi, neft emalı, ilk kimya dərslikləri.*

***Ключевые слова:*** *академик, продуктивный ученый, научный консультант, нефтепереработка, первые учебники по химии.*

***Key words:*** *academic, productive scientist, scientific consultant, oil refining, first chemistry textbooks.*

Azərbaycan Milli Elmlər Akademiyasının həqiqi üzvü, kimya elmləri doktoru, professor, Y.H.Məmmədəliyev adına Neft-Kimya Prosesləri İnstitutunun direktoru, Azərbaycanın əməkdar müəllimi Vaqif Abbasovun 65 yaşı tamam oldu.

Bütün şüurlu həyatını elmimizin inkişafına, xalqımızın maariflənməsinə həsr edən Vaqif Abbasov məhsuldar alimdir. O, çapdan çıxmış 300-dən artıq elmi əsərin, o cümlədən 7 monoqrafiyanın, 15 dərsliyin, 11 dərs vəsaitinin müəllifidir. Həmin elmi əsərlərdən 70-dən artığı xarici ölkələrdə çap olunmuşdur.

Çox mənalı ömür yolu keçən Vaqif Abbasovun 1952-ci il oktyabrın 5-də Tərtər rayonunun Cəmilli kəndində anadan olmuşdur. Orta məktəbi müvəffəqiyyətlə başa vuran gənc Vaqif 1973-cü ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun kimya fakültəsinə daxil olur, oranı bitirdikdən sonra 1973-1978-ci illərdə akademik Y.H.Məmmədəliyev adına Neft-Kimya Prosesləri İnstitutunun aspiranturasına daxil olur və 1978-ci ildə elmlər namizədi elmi dərəcəsini alır. 1978-1981-ci illərdə əmək fəaliyyətinə akademik Y.H.Məmmədəliyev adına Neft-Kimya Prosesləri İnstitutunda başlayan Vaqif Abbasov 1978-1981-ci illərdə əvvəlcə kiçik elmi işçi, 1981-1984-cü illərdə isə baş elmi işçi kimi fəaliyyət göstərmiş, 1991-ci ildə doktorluq dissertasiyasını müdafiə etmiş, 1992-ci ildə isə professor vəzifəsinə seçilmişdir.

Təhsilimizin ən mürəkkəb problemlərinin həllində yaxından iştirak edən Vaqif müəllim TQDK nəzdində kimya fənni üzrə ekspertlər qrupunun və seminarın sədri, Təhsil Nazirliyi nəzdində məktəblilərin kimya olimpiadasını keçirən münsiflər heyətinin rəhbəri, Təhsil Nazirliyi Elmi-Metodik Şurası "Kimya və kimya texnologi-

yası” bölməsinin sədri, Respublika Korroziya cəmiyyətinin vitse-prezidenti, “Kimya məktəbdə” jurnalının baş redaktoru, “Neft kimyası və neft emalı prosesləri” jurnalının baş redaktorunun müavini, Bakı Dövlət Universitetinin professoru vəzifə-lərini tutmuşdur. Təhsilimizdəki xidmətləri-nə görə o, 2005-ci ildə Azərbaycan Respublikası Prezidentinin fərmanı ilə “Azərbaycanın Əməkdar Müəllimi” fəxri adına layiq görülmüşdür.

Geniş elmi biliyə və erudisiyaya malik olan V.Abbasov ölkəmizdə kadr hazırlığı sahəsində də öz əməyini əsirgəməmiş, indiyədək 22 elmlər namizədinin elmi rəhbəri, 6 elmlər doktorunun elmi məsləhətçisi olmuşdur. Onun özünün elmi nailiyyətləri də uğurlu olmuşdur. O, keçmiş SSRİ-də 22 müəllif şəhadətnaməsinin, Rusiya Federasiyasında tətbiq olunmuş 4, Azərbaycan Respublikasında 16 patentin, universitetlər üçün 9 dərsliyin müəllifidir.

Həmişə yenilikçi alim kimi tanınan Vaqif Abbasov nefti sudan təmizləmək və duzsuzlaşdırmaq üçün deemulqator yaradıb, elmi nəticələrinin Azərbaycanın neft emalı komplekslərində tətbiqini gerçəkləşdirib. O, dəri sənayesi üçün dünyada analoqu olan və olmayan yeni aşı maddəsi yaradıb və həmin maddə bir çox ölkədə, o cümlədən Türkiyədə uğurlu sənaye sınaqlarından keçib. Maddənin tətbiq olunması dəri sənayesində işlənən səkkiz maddənin istifadəsini aradan qaldırmağa imkan vermişdir. Bunlardan əlavə, o yenə də dünyada analoqu olmayan müalicəvi Naftalan neftinin struktur-qrup tərkibini müasir metodlarla araşdırmış, müalicəvi komponenti olan naften karbohidrogenlərinin dar fraksiyalarının bioloji aktivliyini də tədqiq eləmişdir. Onu da qeyd etmək lazımdır ki, müalicəvi Naftalan neftinin istifadə tarixində ilk dəfə olaraq V.Abbasovun rəhbərliyi ilə yaradılmış “Ağ naftalan yağı” Azərbaycan Respublikası Səhiyyə Nazirliyində dərman preparatı kimi qeydiyyatdan keçirilmiş və bunun Ukrayna Səhiyyə Nazirliyinin qərarı ilə Ukraynada dərman preparatı kimi satışına icazə verililmişdir.



Əlbəttə, bu elmi uğurların qazanılması təkcə Vaqif müəllimin, onun başçılıq etdiyi kollektivin deyil, bütövlükdə Azərbaycan elminin uğuru kimi qiymətləndirilir.

Vaqif müəllim bacarıqlı elm xadimi olmaqla yanaşı həm də gözəl insandır, onunla ünsiyyət tərəf müqabilini zənginləşdirir, ona ruh yüksəkliyi və qəlbinə hərarət verir. İlk baxışdan elə görünür ki, onunla ancaq elm sahəsində, kimya, xüsusilə neft kimyası mövzusunda söhbət etmək maraqlıdır. Amma elə ilk baxışdan hiss edirsən ki, Vaqif müəllimin mədəniyyətimizdən, tariximizdən, ədəbiyyatımızdan, bütövlükdə mənəviyyatımızdan söhbət edən şəxs kamil insandır, həm də bu zaman dərhal onun dərin və hərtərəfli bilik sahibi olduğunun bir daha şahidi olursan.

Vaqif müəllimin milli və insani təəssübkeşliyi barədə saatlarla danışmaq olar. O, xalqımızın ümummilli problemlərini həmişə şəxsi uğurlarının fövqündə saymağı baca-

ran ziyalılarımızdandır. Yüksək tribunalarda da, kütlələrlə söhbətlərində də o, Azərbaycanın Qarabağ dərdini dilinə gətirir, haqqın öz yerini tutacağından inamla danışır, işğal altında olan torpaqlarımızın azad edilməsi üçün hamının dövlətimizə və Prezidentimizə dəstək olmasının vacibliyini əsaslandırır. Onun dövlətçiliyimizə sədaqəti, xalqımızın gələcəyinə inamı özünü hər söhbətində açıq-aydın göstərir.

Onun ədəbiyyatımıza sevgisi ayrıca bir yazının mövzusudur. Vaqif müəllim gənclik çağlarından qəlbindəki kövrək duyğuları qələmə alır, dost məclisində, söz anlayan yanında şeirlərini oxumağı sevirdi. Onun qələmindən çıxanları oxuyanda vətəndaş qeyrəti, ziyalı təəssübkeşliyi ilə yanaşı, saf adamlara xas olan insani hisslərin şahidi olursan. Heç təsadüfi deyil ki, bu duyğular artıq kitab şəklində üzə çıxaraq oxuculara təqdim olunmuşdur. Onun “Dahilərin, müdriklərin və fatehlərin həyat dərsləri” kitabına əlavə etdiyi “Məhəmməd Peyğəmbər”, “Atilla”, “İbn Sina”, “Keykavus”, “Əl-Qəzali”, “Nəsirəddin Tusi”, “Teymurləng”, “Şeyx Şamil”, “Fəramin Rüzval” mənzum hekayələrigözəl bədii parçalardır. Mənzuma dair “Heydər Əliyev” parçası öz səmimiliyi və bədiiliyi ilə daha çox diqqəti cəlb edir.

Professor Vaqif Abbasov insan kimi bütöv, dost kimi sədaqətli, ziyalı kimi təəssübkeş şəxsiyyətdir. Vaqif müəllim ən çətin anlarda insana arxa-dayaq olur.

V.Abbasov respublika, beynəlxalq və bir çox xarici ölkələrin elmi qurumlarının üzvüdür. “ASSOKOR” assosiasiyasının rəyasət heyətinin üzvü, V.Altunin adına Beynəlxalq Ekologiya və Təbiətdən istifadə Akademiyasının həqiqi üzvü, Avropa Təbiət Elmləri Akademiyasının həqiqi üzvü, Rusiya Təbiət Elmləri Akademiyasının xarici üzvü, Türk Dünyası Tədqiqatları Beynəlxalq Elmlər Akademiyasının həqiqi üzvüdür. Onun rəhbərliyi ilə 11 elmlər doktoru və 34 fəlsəfə doktoru hazırlanmışdır.

Bunlardan əlavə o, “Neftkimyası və neftemalı prosesləri” jurnalının baş redaktorunun müavini, “Kimya məktəbdə” elmi-metodiki jurnalın həmtəsisçisi və baş redaktoru, AMEA-nın “Elm dünyası” jurnalının baş redaktorunun müavinidir.Hazırda V.Abbasov bir sıra elm müəssisələrində çalışmaqla yanaşı, ciddi elmi axtarışlarla da məşğuldur. 2005-ci ildə Prezident İlham Əliyevin müvafiq sərəncamı ilə o "Şöhrət" ordeni ilə təltif edilmişdir.

Alim, həmçinin akademik Y.Məmmədəliyev adına medala, AMEA-nın Fəxri fərmanlarına, İslam ölkələri İqtisadi Əməkdaşlıq Təşkilatının (EKO) “Elm və texnologiya” üzrə mükafatına, Avropa Biznes Assambleyası (Oksford, İngiltərə) tərəfindən “Avropa Keyfiyyəti” mükafatına, “The Name in Science” fəxri adına, Beynəlxalq Sokrat Komitəsinin “Şöhrət” medalına, “Əsas Qızıl Cəngavər” ulduzuna və digər mükafatlara layiq görülüb.

Vaqif Abbasov Heydər Əliyev dövrünün yetirməsidir, Heydər Əliyev zamanəsinin övladıdır, öz təbirincə desək, onun liderlik məktəbinin “məzun”udur. Alim “Liderlik fəlsəfəsi” kitabını da, məhz Ümummilli liderə həsr etmişdir.

“Liderlik fəlsəfəsi”, “Dahilərin, müdriklərin və fatehlərin həyat dərsləri” kitabları ona şöhrət qazandırmışdır.

“Liderlik fəlsəfəsi” kitabı eyni mövzulu kitablar arasında səmimiliyi, baxış bucağı ilə çox seçilir. Böyük zəhmət, intellektual enerji hesabına ərsəyə gələn bu kitab xalqına, dövlətinə və Ümummilli liderinə ürəkdən bağlı olan bir alim tərəfindən yazılmışdır. Heydər Əliyev fenomenini sosiologiya və politalogiya elmində liderliyi müəyyənləşdirən mövcud qanunlara əsasən təhlil və tədqiq edən, bu təhlil və tədqiqi elmi cəhətdən əsaslandıran müəllif onun liderliyi-

ni çox incəlik və həssaslıqla, dəqiqliklə oxucuya çatdıra bilmişdir. Ulu öndərin yüksək liderlik keyfiyyətlərindən heyranlıqla, özü də sübutlarla, tutarlı arqumentlərlə danışır. Onu dünya siyasətçiləri, sərkərdələri, elm adamları ilə müqayisə edir, titanik fəaliyyətini tarixin prizmasından keçirərək təhlil edir, şəxsiyyətini bütün aspektlərdən açıqlayır. Taleyüklü məsələlərdən danışanda isə sabaha inamını qətiyyətlə ifadə edir. Bu inam Prezident İlham Əliyevə, onun strateji xəttinə, çoxşaxəli, irimiqyaslı fəaliyyətinə inamdır. İlham Əliyevin varisliyinin qanunauyğunluq olduğunu əsaslandıran alim Heydər Əliyev siyasətinin Prezident İlham Əliyev tərəfindən uğurla davam etdirilməsinə də kitabda geniş yer ayırır...

“Peyğəmbərimizin Əliyə nəsihətləri var. Onun birində deyilir ki, gələcəkdə o dövlət hakim olacaq ki, onun başçısı bilikdir. Hesab edirəm ki, Azərbaycanın bu günkü səviyyəsi, inkişafı, tanınması, dünya ölkələri sırasına çıxması, məhz böyük Allahın bizə göndərdiyi o bilikli rəhbərin xidmətidir... Bu, Ulu öndər Heydər Əliyevin və onun davamçısı Prezident İlham Əliyevin adı ilə bağlıdır...”

“Liderlik fəlsəfəsi”, əslində dərslik qədər dəyərli kitabdır...

Ölkəmiz müstəqillik əldə etdikdən sonra təhsil sahəsində bir sıra uğurlu islahatlar aparıldı. İslahatın nəticələri bütün fənlər üzrə yeni dərsliklərin yaradılması vəzifəsini qarşıya qoydu. Elmi yaradıcılığında peşəkarlığa, fundamentallığa daha çox üstünlük verən Vaqif müəllim böyük səbr və təmkinlə elmi axtarışlarını tədris sahəsinə yönəltdi və az bir müddətdə müəlliflər qrupunu müəyyənləşdirib VIII-XI siniflər üçün “Kimya” dərsliyini ərsəyə gətirdi. Elmi işlə məşğul olanlar dərsliyin, xüsusən orijinal dərslik yazmağın məsuliyyətini çox yaxşı dərk edirdi. Çünki proqramda yer alan bütün təlim materialı dərslikdə hərtərəfli, yığcam və aydın bir dildə öz ifadəsini tapmalıdır.

Vaqif müəllimin adı müstəqil Azərbaycanın ümumtəhsil məktəbləri üçün ilk milli kimya dərsliyini yaradan alim kimi də tarixə düşüb. Onun bir mühüm xidmətini də xatırlatmaq lazım gəlir. Şagirdlərimiz onun rəhbərliyi ilə kimyadan dünya olimpiadalarında ən nəhəng dövlətlərin şagirdlərinə qalib gəliblər. O, qardaşı, pedaqoji elmlər doktoru, professor Mütəllim Abbasovla əl-ələ verib Azərbaycan balalarını beynəlxalq kimya olimpiadadlarına hazırlayanda da, bu uşaqları öz vəsaiti hesabına dünyanın o başına aparanda da, onların uğurlarına öz övladının uğuru kimi sevinəndə də, yüksək balla ali məktəblərə qəbul olunanlara, Moskvada təhsil alan azərbaycanlı tələbələrə təqaüd kəsəndə də, kənddə bir istedadlı uşağı “kəşf edib” Bakıya gətirib, geniş auditoriyaya tanıdanda da, Naftalan neftinin əsl dəyərini ortaya qoyanda da eyni dərəcədə vətənpərvərdir. Olimpiada qalibləri üçün üzərində Yusif Məmmədəliyev və Nəsirəddin Tusinin barelyefi olan xatirə medallarını hazırlatması isə onun, həm də görkəmli elm adamlarına, fikir sahiblərinə hörmət və ehtiramının nümunəsidir...

Vaqif müəllim mənəvi dəyərlərimizin qayğıkeşidir. Bu qarmaqarışıq dünyada Azərbaycan gənclərinin mənəvi sağlamlığı, ictimai əxlaqı üçün narahatlıq keçirdiyinə görə bu kitabları yazır. Vaqif müəllimin çox sanballı kitablarında tarixin müxtəlif dövrlərində yaşamış, bəşər xəzinəsini öz kəşfləri, ideyaları, dəyərli əsərləri, ibrətamiz fikirləri ilə zənginləşdirmiş müdrik insanların həyat və yaradıcılığı haqqında oçerklər yer almışdır. Alim oxucuların Məhəmməd peyğəmbər, Attila, İbn Sina, Keykavus, Konfusi, Sokrat, Nizami Gəncəvi, Çingizxan, Əbu Həmid əl-Qəzəli, Nəsirəddin Tusi, Əmir Teymur, İsaak Nyuton, Atatürk, Uinston Çerçill, Heydər Əliyev, Lütfi Zadə, Vasim Məmmədəliyev, Abas Çayxorski,

Hüseyn Cavid, Xudu Məmmədov və digər dahilərin həyat dərslərindən faydalanacağına əmindir. Onlar dahiliyi qazanmaq üçün bütöv bir ömür sərf ediblər. Bu kitablar dahilərin zaman-zaman dəyişən nəsillərə keçdikləri müdriklik dərsləridir. Bu dərsləri təqdim edən isə dahilərin varisi akademik Vaqif Abbasovdur.

Vaqif müəllimin AMEA-nın "Azər-baycanın elm və mədəniyyət xadimləri" seriyasından çap olunan "Biblioqra-fiya"sında maraqlı bir məqam vardır. "Nobel mükafatı laureatı, bioloq Ceyms Uotsonun elmdə yaşadığı həyatın dərsləri" də kitaba daxil edilib. Vaqif müəllimin seçdiyi bu dərsdən çox ibrətamiz bir nümunə: "Qoy həmişə sizi xilas edə bilən adamınız olsun". "Məni ucaldan kollektivim var..."

İnsanı xilas edən, onu ucaldan həm də kollektividir.

O, ilk elmi addımlarını indi rəhbərlik etdiyi İnstitutda atıb. Və burada keçdiyi uzun və çox şərəfli yol davam edir...

O, bu kollektivə ailəsi kimi baxır. Direktor olandan sonra bu doğmalığa bir məsuliyyət hissi də əlavə olunub. "Ailə başçısı" kimi hər kəsin qayğısını çəkməlidir. Həyat tərzi ətrafındakı gənclərə örnəkdir.

O yazır: "Ən böyük xoşbəxtliyim düşdüyüm mühitdir. Məni bu kollektiv ucaldıb. Tanrıma borcluyam, məni əməli saleh insanlara tuş eləyib. Bu İnstitutun qapısından girən kəs əgər öz səviyyəsini yüksəltmirsə, günah özündədir. Çünki burada təmənnasız, diqqətli, yolgöstərən, qiymətləndirən mühit var... Üç adamı da xatırlayacağam. 32 il Neft-Kimya Prosesləri İnstitutunun direktoru olmuş akademik Vahab Əliyev. Onun üçün kiminsə oğlu-qızı olmaq əsas deyildi, ağıllı, savadlı olmaq bəs idi. Uzun illər İnstitutumuzun direktoru olan akademik Musa Rüstəmov. Ondan alicənablıq, idarəçilik mədəniyyəti, idarəetmə etikası, elmi dəqiqlik, elmi proqnozlaşdırma qabiliyyəti əxz eləmişəm. Akademik Məhərrəm Məmmədyarov. Mən İnstitutu bitirəndə o, dövlət imtahan komissiyasının sədri idi, cavabımdan çox xoşu gəldi və məni bu İnstituta dəvət etdi. Mənə mənəvi ata olub. Bu gün də ondan məsləhət alıram. Əsas elmi rəhbərim isə Akademiyanın müxbir üzvü, rəhmətlik Məcid Mərdanov olub. Mən onun ömrünü sovet ədəbiyyatında ideallaşdırılan Ostrovskinin həyatı ilə müqayisə edirəm. Çünki bu şəxs müharibədən bir ayağı şikəst qayıdıb, amma sonra Akademiyanın müxbir üzvü olub. Dəmir iradə sahibi idi. Belə təmənnasız, umacaqsız insanlar az olur. Bir də, bu cür insanlar hamının qarşısına çıxmır axı...

İnsan dahi olar, dahi yanında,
Dahi adiləşər nadan yanında..."

Vaqif müəllim qədrdaşlıqla deyir: "Taleyimizdə rolu olan insanları dəyərləndirməmək nadanlıqdır. Müdriklər doğru deyiblər: "Kiməsə yaxşılıq etdinsə, həmin an unut, kimsə sənə zərrə qədər yaxşılıq edibsə, bütün ömrün boyu xatırla". Vaqif müəllim yazır: Yusif Məmmədəliyev Moskvaya gedəndə bütün aspirantları yığıb ən ləziz yeməkləri düzürdü stolun üstünə, özü də xanımı ilə ayrı otağa keçirdi ki, birdən utanıb yeməzlər. Bu kişi tələbələri yataqxanada yerləşdirməsə, onların elmi rəhbərlərini tapıb görüşməsə, Bakıya qayıtmazdı. Bunları necə unutmaq olar?.. "Müdrik adamların sərvəti onların özləridir, onlar öz sərvətlərini özləri ilə gəzdirirlər..."

Vaqif müəllim unikal insandır, elmimizin, mənəviyyatımızın təəssübkeşidir, alicənabdır, xeyirxahdır, ədalətli insandır. Məntiq və sağlam düşüncəyə malik insandır. O, həyatını, varlığını Azərbaycan elminə, təhsilinə həsr edən alimdir. Onun xarakterindəki bütövlük, prinsipiallıq, zənginlik, sözü ilə əməlindəki vəhdət insana çox şey öyrədir. O, həm də gözəl natiqdir. Nitqində böyük cazibə qüvvəsi var. Onun

hər kəlməsində ziyalılıq, ucalıq var. Nitqlərində elmi və mədəni mühiti eyni dərəcədə ehtiva edir. Nitqindəki gözəllik onun daxili aləmindən, zəngin mütaliəsindən irəli gəlir.

Alimin teleçıxışları, “telemühazirə”ləri də hər zaman diqqət çəkir. Bu çıxışlar cəmiyyətin, auditoriyanın da qazancıdır, kimyaya verdiyi töhfələr qədər dəyərlidir. Onun həyat, insan, cəmiyyət haqqında dərin, fəlsəfi fikirləri original olduğu üçün insanı düşündürür, böyük təsir bağışlayır, müsbət enerji verir...

Bu xarakter, bu kamillik, bu “böyük ürək” onun ən qiymətli sərvətidir – hər zaman özü ilə gəzdirdiyi “misilsiz sərvətidir”.

Vaqif müəllim kimyanın qüvvəsinə inandığı kimi, sözün də qüvvəsinə inanır, inanır ki, sözlə dəmir qapıları belə açmaq olar. Özü də sözlə dostluq edir.

Müdrikləri, dahiləri sevə-sevə, öyrənə-öyrənə o özü də müdrikləşib, özü də şairləşib, maraqlı poeziya nümunələrinin müəllifinə çevrilib.

Professor Vaqif Abbasovun çoxşaxəli elmi axtarışlarını, ictimai fəaliyyətini, ziyalı kimi gerçəkləşdirdiyi işləri göz önünə gətirildikcə bir daha əmin oluruq ki, onun yenicə arxada qoyduğu 65 illik ömrünü uğurlu və mənalı saymağa haqqı vardı. Elm sahəsində əldə etdiyi nailiyyətlər, ictimai mühitdə qazandığı nüfuz, insanlar arasında nail olduğu hörmət yaşadığı zəngin və şərəfli ömrün bariz nümunəsidir.

Vaqif Abbasov heç vaxt həyatda qazandıqları ilə kifayətlənmir, özünəməxsus gənclik enerjisi, həvəs və inadla axtarışlarını davam etdirir, elmin yeni-yeni zirvələrini fəth etmək amalı ilə yaşayır, ictimai fəaliyyətini gündən-günə genişləndirərək, elmimizin inkişafı və dövlətçiliyimizin daha da möhkəmləndirilməsi üçün əlindən gələni əsirgəmir.

Professor V.Abbasov ömrünün yetkinlik və müdriklik çağını yaşayır. Vaqif müəllim bu yetkinliyi və müdrikliyi bütün ömrü boyu qazanmışdır, qazandıqlarını da elmimiz və dövlətçiliyimiz naminə bol-bol xərcləmişdir. Şübhə yoxdur ki, insanlarımıza və cəmiyyətimizə bəxş etdikləri bundan sonra daha da zəngin və sanballı olacaqdır.

***Rəyçi: dos. N.Nəcəfov***

**А.Аюбов,**
**Ф.Надир**

**Преданный ученый, интеллигентный педагог**

**Резюме**

В статье рассматривается жизнь академика Вагифа Аббасова. Он был повышен до звания маленького научного работника, директора института. Работа Вагифа Аббасова была достойно оценена нашим государством. Она является почетным учителем республики. Автор 9 учебников.

**A.Ayyubov,**
**F.Nadir**

**Devoted scientist, intelligent pedagogue**

**Summary**

The article deals with the life of academician Vagif Abbasov. He was promoted to the rank of a small scientific worker, director of the institute. Vagif Abbasov's work has been valued by our state worthily. She is the honored teacher of the Republic. Author of 9 textbooks.

***Pedaqogika***



# HUMANİST PEDAQOGİKA: MAHİYYƏT, PRİNSİPLƏR, İSTİQAMƏTLƏR

**Müseyib İlyasov,**
***pedaqogika üzrə elmlər doktoru,***
***ADPU-nun kafedra müdiri***

***Açar sözlər:*** *humanizm, dəyərlər, pedaqoji dəstək, əməkdaşlıq, subyekt.*
***Ключевые слова:*** *гуманизм, ценность, педагогической поддержки, сотрудничество, субъект.*
***Key words:*** *humanism, values, pedagogical support, cooperation, subject.*

Respublikamız ikinci dəfə müstəqillik qazandıqdan sonra siyasətdə, iqtisadiyyatda, mədəniyyətdə, bir sözlə real həyatımızın bütün sahələrində həyata keçirilən müstəqil siyasət və islahatlar ölkənin inkişafının bilavasitə bağlı olduğu təhsil sahəsində də qlobal dəyişikliklərin aparılmasına səbəb oldu. Ötən illər ərzində bu sahədə xeyli işlər görülməsinə baxmayaraq, hazırkı inkişaf tendensiyaları bütün təhsil pillələri üzrə pedaqoji prosesdə daha səmərəli, daha yüksək nəticələrə səbəb ola biləcək yeni yanaşmaların olmasını tələb edir. Belə yanaşmalar çoxdur. Onlardan biri də pedaqoji prosesdə humanist pedaqogikanın prinsiplərinin gözlənilməsi, pedaqoji prosesə humanist yanaşmaqdır.

Humanist pedaqogika və ya pedaqoji prosesə humanist yanaşma olduqca qədim tarixə malik olan bir problem olmaqla yanaşı, həm də yeni, müasir dövrümüz üçün aktual olan bir problemdir. Hələ XVII əsrdə elmi pedaqogikanın banisi Y.A.Komenski məktəbi humanistlik emalatxanası adlandırırdı. Yəni, məktəb bütün funksiyaları ilə yanaşı, öyrədənlərlə öyrənənlər arasında humanist münüsibətlərin bərqərar olduğu bir yer, həm də böyüyən nəslə humanizm aşılayan, onu förmalaşdıran bir ocaq olmalı idi.

Məktəb zaman - zaman bu funksiyanı bu və digər formalarda və məzmunda yerinə yetirsə də, real təcrübədə bunun əksinə az təsadüf olunmamışdır. Nəzəriyyədə, dildə bu problemdən geniş bəhs olunsa da, məktəbdə yenə də müəllim əsas sima olaraq qalmış və təhsildə şagirdyönümlülük deyil, müəllimyönümlülük üstünlük təşkil etmişdir. Hazırkı dövrün məktəbinə, müəlliminə və şagirdlərinə tamamilə yeni, daha mütərəqqi və müasir tələblər verildiyindən təhsilin humanistləşdirilməsi və pedaqoji prosesdə humanist pedaqogikanın prinsiplərinin önə çəkilməsi prioritet vəzifələrdən birinə çevrilir. Humanistlik prinsipinin təhsil sahəsində dövlət siyasətinin əsas prinsipləri sırasında xüsusi yer tutması da bununla əlaqədardır.

Humanist pedaqogika şəxsiyyətə tərəf dönüşü, ona hörmət və inamı, ləyaqətli münasibəti, onun şəxsi məqsədlərinin, tələblərinin və maraqlarının qəbul edilməsini nəzərdə tutur. Bu həm də təhsilalanların bacarıq və qabiliyyətlərinin inkişafı və onla-

rın öz gündəlik həyatındakı tələbatlarının hərtərəfli təmin olunması meyli ilə bağlıdır. O, tədris fəaliyyətində müəllimlərlə şagirdlərin, pedaqoqlarla tələbələrin bir – birindən kənarlaşma hallarına, qütbləşməyə ziddir.

Pedaqoji fikir tarixində və praktik pedaqoji fəaliyyət təcrübəsində humanist pedaqogikanın nəzəri və praktik cəhətdən əsaslandırılması üzrə bir sıra pedaqoqlar- Y.A.Komenski, İ.H.Pestalossi, K.D.Uşinski, Y.Korçak, V.A.Suxomlinski, psixoloqlardan A.Maslou, K.Rocers, Ş.A.Amonaşvili, Azərbaycan alimləri Ə.Ə.Əlizadə və Y.R.Talıbov xeyli işlər görülmüşlər. Bununla yanaşı, nəzəriyyədən praktikaya keçiddə hələ də bir çox problemlər qaldığından bu sahədə görüləcək işlərə xeyli ehtiyac vardır.

Qeyd etmək lazımdır ki, pedaqogika elminin özü mahiyyət və məzmununa görə humanist xarakterə malik bir elm və incəsənətdir. Onun mahiyyətində böyütmək, boya-başa çatdırmaq, tərbiyə etmək, gələcəyə hazırlamaq, öyrətmək, təhsil vermək və ş. kimi keyfiyyətlər və vəzifələr olduğundan bunları yerinə yetirmək humanizm olmadan mümkün deyildir. Ona qeyri - humanist yanaşma pedaqoji prosesdə sxolastikaya qayıtmaq olardı ki, bu da həm pedaqogika elminin məqsəd və məramı ilə, həm də müasir təhsilin qarşısında duran vəzifələrlə daban - dabana ziddir. Bu baxımdan humanist pedaqogika pedaqoji prosesdə humanist texnologiyaları özündə ifadə etməklə müəllimlərin ona ciddi, hərtərəfli və qəlbən hazır olmalarını tələb edir. Lakin təəssüflər ki, hələ də pedaqogika, pedaqoji proses avtoritar pedaqogikanın təsirindən qurtara bilmir. Hələ 7 iyul 2011-ci ildə görkəmli pedaqoq Ş.A.Amonaşivilinin rəhbərliyi ilə bir qrup novator müəllimlər tərəfindən elan edilən “Humanist Pedaqogika Manifesti”ndə bu sahədə olan problemlər geniş təhlil edilmiş və bir sıra maraqlı məsələlər qaldırılmışdır. Göstərilir ki, insanın düşüncəsini genişləndirən, yüksəldən, onu hərəkətli fəaliyyətə çağıran və insansevər pedaqoji düşüncəmiz üçün həqiqətlərin qorunub saxlandığı Müəllim, Şagird, Məktəb, Tərbiyə, Təhsil, Dərs uşaq, Uşaqlar, Qayğı, Mənəvilik, İnsansevərlik kimi müqəddəs sözlərin mənəvi mahiyyətinin pedaqoji düşüncənin cansız və mənəviyyatsız skleti ilə əvəz olunmuşdur: Müəllim – təlim edən şəxs, predmeti tədris edən, Məktəb - təlim-tərbiyə müəssisəsi, Tərbiyə – böyütmək, təhsil vermək, davranış qaydalarını öyrətmək, Təhsil – təlim, maarifləndirmə, Dərs – təlimim əsas forması, Humanizm – ictimai fəaliyyətdə insanlıq, vicdanlı, qeayğıkeş, mədəni və s.kimi qəbul edilmişdir. Belə düşüncələr ancaq avtoritar pedaqoji təfəkkürə qulluq edə bilər. Mənəviyyatın ölçülməsi bizə bu və digər anlayışları dərk etmək və onlara öz gizli mənalarını geri qaytarmağa kömək edir ki, bunun da nəticəsində bizim qarşımızda insansevər pedaqoji təfəkkürün gözəl üfüqləri açılmış olur: Müəllim – Nurun daşıyıcıdır. Şagird – Nur axtaran qəlbdir. Onların görüşü - Dərsi (pedaqoji prosesi) doğurur – birgə yüksək həyatın xüsusi zolağını, hansı ki, bu zaman böyüməkdə olan insan-şagird Müəllimdən aldığı İşıqla dolur, həvəslənir və öz mənəviyyatının bəxşişlərini yaymaq üçün bütün dünyaya istiqamətlənir. Tərbiyə - sözün özünün bildirdiyi kimi böyüməkdə olan insanın mənəvi qidasıdır, o mənəvi qida – obrazlarla qidalanır. Təhsil - insanda İlahi Obrazın açılması sirridir. İlahi Obraz insanda gözəllik, məhəbbət, xeyirxahlıq, biliklər kimi yüksək obrazların axını vasitəsi ilə açı-

lır. Bu axınların mənbəyi Müəllim, Tərbiyəçidir. Məktəb (lat. scalae) insan ruhu və mənəviyyatının yüksəlməsi üçün pilləkəni bildirir. Bu pilləkan Müəllimdədir, Tərbiyəçidədir və o elə Məktəbin özüdür. Uşaq – dirçəldilmiş yeni varlıqdır. Uşaqlar – həqiqətdə fəaliyyət göstərən xalqdır. Qayğı - ilhai sirrin arxasınca getmək kimi başa düşülür. İnsansevər pedaqogika özünün anlayış dərəcələri qismində bunları nəzərdən keçirir: Məhəbbət, İnam, Ümid, Sevinc, Uğur, Əməkdaşlıq, Ruhlandırma, İlham (8).

Humanist pedaqogikanın əsas istiqamətləri nədən ibarətdir, o, nəyi önə çəkir və nəyi tələb edir? Bu sualı aşağıdakı kimi cavablandırmaq olar:

1. Milli və ümumbəşəri dəyərlərə yüksək münasibətin göstərilməsi. Humanist pedaqogika ilk növbədə milli və ümumbəşəri dəyərlərin qorunması, onların təhsil və tərbiyə prosesinin ayrılmaz tərkib hissəsi kimi qəbul edilməsini önə çəkir. Torpaq, Vətən, ailə, təhsil, uşaq, adət-ənənə, mənəvi, maddi və digər dəyərlərə hörmət edilməsini və onların təhsilalanlara aşılanmasını zəruri hesab edir. Məktəblilərdə humanist dəyərlərin tərbiyə edilməsi təkcə təhsilalanlarda deyil, eyni zamanda təhsilverənlərdə də humanist dünyagörüşün, humanizm keyfiyyətlərinin möhkəmlənməsində və humanist təfəkkürün formalaşmasında mühüm əhəmiyyət kəsb edir.

2. Uşaq hüquqlarına və azadlıqlarına hörmət edilməsi. “Uşaq Hüquqları Konvensiyası”nda deyilir: “Uşaq öz baxışlarını azad ifadə etmək hüququna malikdir, özü də həmin uşaqla bağlı hər hansı məsələlərin həlli zamanı bu baxışlara diqqət yetirilməlidir... Uşaq öz rəylərini ifadə etmək və sərhədlərdən asılı olmayaraq, informasiya almaq, informasiya və ideyalar vermək hüququna malikdir” (2).

Uşaq hüquqları və azadlıqlarının qorunmasını və təlim-tərbiyə prosesində uşaqların azad inkişafına nail olunmasını humanist pedaqogika prioritet məsələlərdən biri hesab edir. Uşaq şəxsiyyətinə hörmət və onları şəxsiyyət kimi qəbul etmək, müəllim-şagird münasibətlərində ədalətli, obyektiv mövqe tutmaq, necə oxumasından və qabiliyyətindən asılı olmayaraq hər bir şagirdə yüksək qayğı və etimad göstərmək kimi məsələlər humanist pedaqogikanı xarakterizə edən cəhətlər kimi özünü göstərir. Təhsilverənlərin təhsilalanlara insani münasibətlərini özündə cəmləşdirən bu istiqamət humanist pedaqogikanın əsas müddəalarından birini təşkil edir.

3. Təhsilalanların sağlamlığı və təhlükəsizliyinin qorunması. Gənc nəslin sağlamlığının və təhlükəsizliyinin təmin edilməsi və bunlara zidd olan hallara yol verilməməsi humanist pedaqogikanın əsas prinsiplərindən birini təşkil edir. Təhsil də, tərbiyə də elə təşkil edilməli və aparılmalıdır ki, şagirdlərin nə sağlamlığına, nə də təhlükəsizliyinə heç bir xələl gətirməsin. Təhsilin məzmunu və şəraiti gənc nəslin fiziki və mənəvi sağlamlığını təmin edə biləcək səviyyədə təşkil edilsin. Sağlam təhsil sağlam gələcək olduğundan onun təmin olunmasına humanist pedaqogika xüsusi önəm verir.

4. Ətraf mühitə, insanlara qayğı və hörmətin ifadə edilməsi. Təhsil və tərbiyə prosesində ətraf mühitə, insanlara qayğı və hörmətin ifadə edilməsi və bunların təhsilalanlara aşılanması humanist pedaqogikanın əsas prinsiplərindən birini təşkil edir. Bunlar təhsilin məzmununda və müəllimin hərəkət və davranışında özünü göstərməklə bərabər, həm də təhsilalanlara

da tərbiyə edilməli, aşılanmalıdır. Təhsilalanların müəllimlərin hərəkət və davranışında bunları hər an görmələri, hiss etmələri onların bu istiqamətdə tərbiyəsində müəyyən izlər qoyur.

Təlim güclü və başlıca tərbiyəedici vasitə olduğundan hər bir fənn müəllimi tədris etdiyi fənnin potensial itərbiyəedici imkanlarından istifadə etməklə şagirdlərdə humanizm keyfiyyətlərinin formalaşdırılmasına xüsusi diqqət yetirməlidirlər. Keçdiyi dərslərdə özünün şəxsi nümunəsi ilə şagirdlərdə humanist hisslər və keyfiyyətlər aşılamaqla yanaşı, konkret mövzunun imkanlarından da yaradıcılıqla istifadə etməyi, daha doğrusu, mövzunun tərbiyəvi ünsürlərini üzə çıxarmağı bacarmalıdır. Nümunə kimi bir mövzunu nəzərdən keçirək.

Hamımızın uşaqlıqdan qarışqanı haqlı saydığımız və düzgün hərəkət etdiyi qənaətində olduğumuz rus şairi A.Krılovun “Cırcırama və qarışqa” təmsilindəki obrazların təhlilində müəllim uşaqların qəlbində humanist hisslər yarada bilən situasiyanı da nəzərdən qaçırmamalıdır. Qarışqa haqlıdır, yayda qışı fikirləşib və özünə yem toplayıb. Cırcırama isə bütün yayı nəğmə oxumaqla məşğul olub, qarşıdan gələn qışı nəzərə almayıb. Obrazlar fərqlidir. Biri zəhmətkeş, digəri isə sabahı düşünməyən. Bəs şagirdlərin münasibətləri necə?

Əminliklə demək olar ki, bu, müəllimdən, onun pedaqoji ustalığından və bu obrazlara necə münasibət göstərməsindən çox asılı olacaqdır...

Təbii ki, müəllim qarışqanın haqlı olduğunu qeyd etməklə, cırcıramaya haqq qazandırmayacaqdır. Mövzunun qayəsi də bundan ibarətdir. Lakin, verdiyi şərh zamanı uşaqların bir qisminin qəlbindəki humanizm qığılcımlarını da yaddan çıxarmamalıdır. Əlacsızlara, imkansızlara, yardıma ehtiyacı olanlara kömək göstərmək, yardım etmək, imkansızların əlindən tutmaq kimi humanist addımlar atmağın lazım olduğuna, uşaqların qəlbində bu sahədə olan qığılcımların artmasına, alovlanmasına da diqqət yetirməlidir.

5. Tolerantlıq və dözümlülüyün təmin edilməsi. Humanist dəyərlər içərisində xüsusi yeri olan tolerantlıq və dözümlülük humanist pedqogikanın da əsas istiqamətlərindən biridir. Təhsilalanlara qarşı tolerantlıq onları öz istəkləri, arzuları ilə birgə qəbul etməkdir. Onlara həssas və nikbin münasibət göstərmək, onlarla səbrlə, təmkinlə işləmək, heç bir qeyri – humanist hərəkət və davranışa yol vermədən qəbul edə bilmək bu cəhətdən xüsusi əhəmiyyət kəsb edir. Humanist pedaqogikanın ən başlıca müddəalarından olan bu amilə mühüm diqqət yetirilməsi hər bir müəllimin fəaliyyətində öz əksini tapmalıdır.

6. Pedaqoji dəstəyin verilməsi. Təhsilalanlara pedaqoji dəstəyin verilməsi təhsildə humanizm prinsipinin reallaşdırılması və təhsilin humanist istiqamətliliyinin təmin olunmasıın əsas istiqamətlərindən biri kimi olduqca xarakterikdir. Pedaqoji dəstək təhsilalanların inkişafına maneçilik törədən hər hansı bir maneənin aradan qaldırılması, onlar üçün rahat psixoloji şəraitin yaradılması, təhsilverənlərə etimad göstərilməsi, onlara güvənilməsi pedaqoji dəstəyin əsas mahiyyətini təşkil edir. Pedaqoji dəstəyin verildiyi bütün hallarda müəllimin uşaq şəxsiyyətinə humanist yanaşması, humanist istiqamətlilik vardır. Bütün bunlar onu göstərir ki, pedaqoji dəstək təlim və tərbiyədə humanizm prinsipinin reallaşdırılmasının ən təsirli mtodlarından biri kimi pedaqoji prosesdə mühü yer tutur. Bunsuz

müasir təhsilimizi və təhsildə müvəffəqiyyət qazanmağı təsəvvür etmək çətindir. Görkəmli Azərbaycan mütəfəkkiri, əxlaq nəzəriyyəçisi N.Tusi yazırdı: "Uşağı mehribançılıq və məhəbbət doğuran kəramətlərlə tərbiyə etmək lazımdır, xüsusilə ağıla, şüura, idraka təsir edən başa salmaq yolu ilə... Uşaqda xoşagələn bir hərəkət baş verdikdə onu tərifləyib həvəsləndirmək lazımdır (3, 157-158).

7. Pedaqoji əməkdaşlıq. Müasir məktəb müəllimin "hakimi - mütləq" olduğu və avtoritar üslublarla hərəkət etdiyi bir müəssisə deyildir. Müasir məktəb müəllimin bütün pedaqoji məharətinin aşkarlandığı, gənc nəslin həyata hazırlığının formalaşdırıldığı, gələcək cəmiyyətimizin təməlinin qoyulduğu, əsaslarının möhkəmləndirildiyi müqəddəs bir yerdir. Buradakı fəaliyyətin əsas məzmunu humanizm prinsipi üzərində qurulur.

Humanizm, pedaqoji fəaliyyətdə humanistlik pedaqoji peşənin bilavasitə daxili mahiyyəti, məqsədi və mərami ilə bağlıdır. Pedaqoji peşənin bu xarakteri müəllim şəxsiyyətinin əsas parametrlərini, onun necə olduğunu, yaradıcılığının səviyyəsini və fərdiyyətinin əsas mahiyyətini özündə əks etdirir.

Müəllim əməyi özü humanist bir missiyanın həyata keçirilməsi ilə bağlıdır. Müəllim elə bir fəaliyyətlə məşğuldur ki, bu fəaliyyət bilavasitə tərbiyə olunan şəxsiyyətin və bunun nəticəsi kimi cəmiyyətin gələcəyi ilə bağlıdır. Bu isə ümumibəşəri humanist məqsəddir.

Müəllim bu gün yaşayır, bu gün çalışır. Lakin onun gördüyü işlər gələcəyə yönələn işlərdir. O, bu gün apardığı təlim – tərbiyə işləri ilə öz xalqının milli – mənəvi sərvətlərinin, eləcə də ümumbəşəri dəyərlərin qoruyucusu kimi çıxış etməklə yanaşı, həm də gələcək cəmiyyətin əsasını qoyur.

Humanizm ilk növbədə müəllim peşəsinin məqsədinin, onun daşıdığı missiyanin daxilində və müəllim ifadəsinin özündə mövcuddur. Müəllim o zaman əsl müəllim kimi uşaqların qəlbinə yol tapır ki, məhz bu keyfiyyət onun biliyi, elmi, öyrətmək həvəsi ilə birləşərək bir vəhdət təşkil etsin. Görkəmli rus yazıçısı və pedaqoqu L.N.Tolstoy bu münasibətlə yazırdı: "Əgər müəllim yalnız işi sevirsə, o yaxşı müəllim olacaqdır. Əgər müəllim şagirdi yalnız bir ata və bir ana kimi sevirsə, o bütün kitabları oxuyan, lakin nə işə, nə də şagirdlərə məhəbbəti olmayan müəllimdən daha yaxşı müəllim olacaqdır. Əgər müəllim sənətinə və şagirdlərə olan məhəbbətini özündə birləşdirirsə, o kamil müəllimdir" (7, 362).

Görkəmli Azərbaycan maarifçi-pedaqoqu F.Köçərlinin: "Müəllim məktəbin canı, camaatın çırağıdır. O, öz peşəsini sevməli, şagirdlərini övladı kimi istəməli, xeyir verən biliklər aşılamaqla əhalinin rəğbət və məhəbbətini qazanmalıdır" – fikri L.N.Tolstoyun müəllim haqqındakı düşüncələri ilə həmahəng səsləşir.

XX əsrin sonlarından pedaqogikada humanist meyllərin güclənməsi, insan amilinin önə çəkilməsi, şəxsiyyətyönümlü təhsil məsələsinə böyük diqqət vərilməsi müəllim peşəsinin humanist istiqamətinə daha ciddi yanaşmalara səbəb olmuşdur. Müəllimin (avtoritar üslubunun əksinə olaraq) sinifdə şagirdləri fəal əməkdaşlığa cəlb edə bilməsi,

şagirdi obyekt səviyyəsindən çıxararaq özünə tərəf – müqabil etməsi, fəaliyyətini “subyekt-subyekt” əsasinda təşkil etməsi, təlim-tərbiyə işlərində şagird şəsiyyətinə hörmətlə yanaşması kimi məsələlər müəllim fəaliyyətinin humanist istiqamətinə yeni çalarların daxil olması zəruriyyətini daha da artırmışdır. “Məktəbin humanistləşdirilməsi təlim prosesində yeni tipli müəllim – şagird münasibətlərinin bərqərar olmasını nəzərdə tutur. Şagirdin insan ləyaqətinə hörmət etmək, ona etibar və inamla yanaşmaq, bir şəxsiyyət kimi onun, tələbatları və mənafeyi ilə hesablaşmaq – məhz bu keyfiyyətlər müəllimlərin şagirdlərlə münasibətlərinə nurlu insani çalarlar bəxş edir” (5, 138 ).

Şagirdlərdə inam və cəsarət formalaşdırmaq lazımdır. Müəllim şagirdlərə inandığını, onları sevdiyini, hər bir şagirdə güvəndiyini özünün sözü, hərəkət və davranışı ilə hiss etdirməli, bildirməlidir. Şagirdlərə elə münasibət göstərilməlidir ki, onlar sadəcə uşaq və şagird deyil, cəmiyyətin fəal və gərəkli bir üzvü olduqları inamına gəlsinlər.

Görkəmli psixoloq Deyl Karneqi (ABŞ) “Coneral motors” şirkətində apardığı müşahidələr nəticəsində sübut etmişdir ki, əmək məhsuldarlığının cəmi 15 faizi texniki biliklərin, 85 faizi isə müəssisə rəhbərliyinin fəhlə ilə xoş rəftarının, işçinin əhval-ruhiyyəsinin hesabınadır.

Bizə belə gəlir ki, təhsil prosesi də belədir. Müəllimin şagirdlərlə xoş münasibəti, səmimi ünsiyyəti müvəffəqiyyət qazanmağın əsas şərtlərindən biridir.

Humanizm pedaqogikanın əsas atributlarından biridir. Süni, avtoritar yolla qazanılan nüfuzdan fərqli olaraq, öz yetirmələrinə hörmətlə, qayğı ilə yanaşan, onu şəxsiyyət kimi qəbul edən, onları sevən müəllimlərin şagirdlərə məhəbbəti həmişə dərin, şagirdlərin isə onlara inamı möhkəm olur. O müəllim özünü xoşbəxt hesab edə bilər ki, uşaqlar onun dərslərinə həvəslə gəlirlər, ayrıldıqda isə onunla yenidən görüşmək arzusu ilə sabahı gözləyirlər.

Pedaqoji peşədə humanizm heç də müəllim tələbkarlığını inkar etmir və hamıya, hər şeyə güzəşt edilməsi demək deyildir. Əksinə, burada hörmət və tələbkarlığın elə bir sintezi reallaşır ki, şagird şəxsiyyətinin inkişafı üçün real imkanlar yaranır. Belə şəraitdə şagird öyrənməyə, daha çox bilməyə həvəsli və maraqlı olur. Yaradılmış şərait, qarşılıqlı münqsibət şagirdlərin gələcək inkişafına yeni-yeni impulslar verir, onlarda stimullar yaradır. Buna görə də “Müəllim – şagird münasibətlərinin humanistləşdirilməsi böyük bir anlama – şagirdin bir şəxsiyyət kimi formalaşmasına, inkişaf etməsinə, özünüaktuallaşdırması üçün şəraitin yaradılmasına xidmət etməlidir” (5, 137).

Şagird şəxsiyyətinə humanist yanaşma mövqeyi həmçinin, pedaqoji ustalığa gedən ən mühüm yollardan biri, bəlkə də birincisidir. Qabaqcıl və novator müəllimlərin təcrübəsi göstərir ki, pedaqoji prosesin əsasında bu varsa pedaqoji ustalığın digər yollarını tapmaq, onun incə çalarlarını öyrənmək, tətbiq etmək bir o qədər çətin olmur. Əgər bu yoxdursa hətta ən kəsərli metodların, yolların tətbiqi belə faydasız olacaqdır. Ən qabaqcıl texnologiyaların tətbiqi də, müəllimin öz üzərində daimi işləməsi də, özünü təkmilləşdirmə marağı da məhz ilk növbədə bundan – humanizmdən, öz peşəsini və uşaqları sevməsindən irəli

gəlir. Bu gün adları hörmətlə çəkilən İ.H.Pestalossi, L.N.Tolstoy, Y.Korçak, A.S.Makarenko, V.A.Suxomlinski, M.T.Sidqi, F.Köçərli, Ü.Hacıbəyov, A.Şaiq və digər klassik pedaqoq və maarifçilərin və bu gün müasirlərimiz olan onlarla, yüzlərlə ustad müəllimlərin həyatı və peşə, sənət uğurları bunu sübut edir.

Polşada doğulan və əslən yəhudi olan görkəmli pedaqoq, həkim Yanuş Korçak 1942-ci ilin avqustunda faşistlər tərəfindən azad oması haqqında rəsmi məlumat almasına baxmayaraq, tərbiyə etdiyi 192 nəfər uşaqdan, şagirdlərindən ayrılmayaraq onlarla birlikdə ölüm düşərgəsinə getmiş və qaz kamerasında həlak olmuşdur. İnsansevərliyin, uşaqlara məhəbbətin ali zirvəsi bax budur, bundan o yana yol yoxdur.

V.A.Suxomlinski yazırdı: "Tərbiyəçinin ən qiymətli keyfiyyətlərindən biri insanlıqdır, uşaqlara dərin məhəbbətdir, atanın, ananın səmimi nəvazişi ilə müdrik ciddiliyini və tələbkarlığını özündə birləşdirən məhəbbətdir" (4, 12).

Təcrübə göstərir ki, uşaqlara qarşı qəlbində sevgi olmayan, onlarla işləməkdən zövq almayan şəxslərin bəri başdan müəllimlik peşəsini, pedaqoji peşəni seçməməsi daha faydalıdır. Humanistliyi olmayan müəllim tələbkarlıqda nəyəsə nail olsa da, şagirdlərinin qəlbinə yol tapmağa nail ola bilmir, onların sevgisini, rəğbətini qazana bilmirlər.

XVI əsrdə yaşamış humanist F.Me-lanxton səhər - səhər məktəbə daxil olarkən balaca uşaqlara üzünü tutub deyərmiş: "Sabahınız xeyir, gələcəyin məşhur, müdrik, şöhrətli alimləri, səfirləri, hakimləri, kanslerləri, katibləri, magistrləri, professorları, sabahınız xeyir!" Çox vaxt buna görə ona irad tutanlara deyərmiş: "Mən zarafat etmirəm, ciddi deyirəm. Mən uşaqlara indiki uşaqlar kimi baxmıram. Axı onları tərbiyə etmək üçün bizə verirlər. Mən həmin məqsədi nəzərdə tuturam. Mən əminəm bu uşaqlar gələcəkdə dediyim kimi, alim, kansler... olacaqlar."

Təəssüflər olsun ki, çox vaxt nəinki uşaqlara, hətta cənclərə də gələcəyin deyil, bu günün prizmasından yanaşma, bugünki, uşaqlar, gənclər kimi baxmaq daha çox üstünlük təşkil edir.

Humanizm və humanist pedaqogika mənəviyyatla sıx bağlıdır. "Humanist Pedaqogika Manifesti"ndə bu münasibətlə deyilir: "Mənəviyyat və İnsansevərlik anlayışları məna və yol, məzmun və forma olaraq bir biri ilə sıx kəsişirlər. Onlar birlikdə insansevər pedaqogikanın mənasını əmələ gətirirlər: insansevər pedaqogika böyüməkdə olan insanın şəxsiyyətinin oturuşmasının mənəvi insansevərlik anlayışı əsasında hazırlanmış məzmun və vasitələr sistemi vasitəsi ilə nəzəri və yaradıcılıq təcrübəsidir.... Uşaqlara məhəbbət, yaxşılıq, anlayış, kömək, həvəsləndirmə, ilham, müdafiə pedaqogikası lazımdır. Elə pedaqogika lazımdır ki, o uşaqlarda mənəviyyat, alicənablıq, xeyirxahlıq yetişdirəcək, onların dərketmə cəhdlərini genişləndirəcək, öz təyinatları üzrə yönləndirəcək. Bu, insansevər pedaqogikadır" (8).

Bu günün pedaqogikası belə olmalıdır. Müəllimlər, tərbiyəçilər, təhsil və tərbiyə ilə məşğul olan hər bir kəs bunları yerinə yetirməlidir, bunlara nail olmalıdır. Pedaqoji prosesin əsasında uşaqlara, pedaqoji prosesə humanist münasibətlər dayanmalıdır.

"Humanist münasibətlər şagirdin şəxsiyyətinə maraqdan, onun vəziyyətinə şərik olmaqdan, fikrinə hörmət etməkdən,

tədris fəaliyyətinə yüksək tələbkarlıqdan, şəxsiyyətin inkişafına qayğı göstərməkdən və s. ibarətdir” (6, 43 ).

Beləliklə, humanist pedaqogikanın müddəalarından çıxış edərək təhsil prosesinin humanistləşdirilməsi üçün aşağıdakı bir sıra şərtlərin gözlənilməsini vacib hesab etmək olar:

1.“Müəllim–şagird” əməkdaşlığından “şagird–müəllim” əməkdaşlığına keçmək.

2. “Subyekt–obyekt” əməkdaşlığından “subyekt–subyekt” əməkdaşlığına keçmək.

3. Dərsdə şagirdlərin fəallığına maksimum səviyyədə nail olmaq.

4. Pedaqoji prosesi şagirdyönümlü, əməkdaşlıq və inkişafı qabaqlama prinsipləri əsasında qurmaq.

Pedaqoji prosesin humanistləşdirilməsi müəllim nüfuzunun yüksəlməsinə, təhsilalanların isə inkişafına olduqca müsbət təsir göstərir. Təhsildə humanizm prinsipininin reallaşdırılması zamanı öyrədici fəaliyyət şagirdə, onun öyrənməsinə, təlim materialını dərindən mənimsəməsinə yönəldildiyindən bu əməkdaşlıq şagirdləri pedaqoji prosesin tərəf - müqabili kimi fəallaşdırmağa xidmət edir. Pedaqoji prosesin şagirdlərin fəal fəaliyyəti, onların bilavasitə müəllimlə qarşılıqlı, birgə fəaliyyəti nəticəsində baş verməsi dərsin səmərə və keyfiyyətini, yaddaqalmanın uzunmüddətli olmasını və pedaqoji prosesin məhsuldarlığını artırır.

Pedaqoji əməkdaşlıq yüksək olan dərslər maraqlı və məzmunlu olmaqla yanaşı, bir növ şagirdləri maqnit kimi özünə çəkir. Belə dərslərə şagirdlər həvəslə gəlir, dərsdə dialoq, sərbəst düşüncə, həm sağlam psixoloji mühit, həm də valeoloji istiqamətdə sağlam şərait yaranır. Şagirdlər vaxtın necə keçdiyini hiss etmir, dərsdə darıxmır və onun tez qurtaracağına tələsmirlər.

Pedaqoji prosesin əməkdaşlıq əsasında təşkili zamanı müəllim monoloji nitqindən dialoji təlim formasına keçməklə şagirdlərin dərs zamanı fəallığını təmin etmiş olur. Şagirdlər qarşılıqlı kömək, sağlam rəqabət şəraitinə düşürlər ki, bu da onların arasında “bilik mübadiləsinə” geniş imkanlar açır. Müəllim onların məntiqi, tənqidi və yaradıcı təfəkkürlərinin “işləməsinə” nail olur. Onların təfəkkürü, nitqi, təxəyyülü, diqqət və hafizələri kompleks halda inkişaf edir. Belə dərslərdə şagirdlərə böyük hörmət və etimad göstərilir, təlim prosesi yüksək hörmət və tələbkarlıq əsasında həyata keçirilir. Şagirdlər nəyi isə öyrəndiklərini dərk edirlər. Nəticədə şagirdlərin müəllimlərinə qarşı hörmət və məhəbbəti artır, onların tələb və göstərişləri şagirdlər tərəfindən sözsüz yerinə yetirilir və təlim prosesi yüksək müvəffəqiyyətlə nəticələnir. Elə bir qapalı dövrə yaranır ki, burada öyrədənlə öyrənənlər arasında qarşılıqlı hörmət, öyrənməyə və öyrətməyə stimullar, motivlər formalaşır. Müəllim bələdçi, fasilitator, şagirdlər isə axtaran, tapan, tədqiqat aparan, informasiya mübadiləsi, ümumiləşdirmə edən və nəticə çıxaran, özünün və yoldaşlarının bilik və bacarıqlarını qiymətləndirməyi bacaran rollarında fəaliyyət göstərirlər. Bütün bunlar təlim prosesində müəllim və şagirdlərin qarşılıqlı əlaqəsinə, dərs prosesinin “subyekt–subyekt” münasibətlərində təşkilinə, pedaqoji əməkdaşlığın kommunukativ müstəvidə reallaşmasına səbəb olur. Bu da dərsdə “müəllim – şagird”, “şagird – şagird” və “şagird – müəllim” münasibətlərinin emosional çalarlarını artırır, təlim motivlərini dərinləşdirir, şagirdlərin

özünəinamını gücləndirir, nəticənin səmərəli və daha məhsuldar, təlim prosesinin nəticəyönümlü olmasını təmin edir.

Humanizm pedaqoji prosesin və pedaqogika elminin məramını, mahiyyətini və məzmununu birləşdirən və özündə əks etdirən bir prinsipdir. Pedaqogikada, pedaqoji prosesdə və müəllim fəaliyyətində bu yoxdursa, deməli pedaqogika da yoxdur, pedaqoji proses də, müəllim də!

## İstifadə edilmiş ədəbiyyat

1. Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu. Bakı, "Hüquq ədəbiyyatı" nəşriyyatı, 2010.
2. Uşaq Hüquqları Konvensiyası. Bakı, 1998.
3. N.Tusi. Əxlaqi-Nasiri. Bakı, Elm, 1989.
4. Suxomlinski V. Ürəyimi uşaqlara verirəm. Bakı: Maarif, 1978.
5. Əlizadə Ə. Pedaqoji psixologiya. Bakı, ADPU, 2010.
6. Paşayev Ə., Rüstəmov F. Pedaqogika. Bakı: Nurlan, 2007.
7. Толстой Л. Педагогические сочинение. Москва, 1956.
8. Humanist Pedaqogikası Manifesti. 7 iyul 2011-ci il.
9. Амонашвили Ш. Основы гуманной педагогики. Кн. 5. Учитель. М.: Амрита, 2013.

**М.Ильясов**

**Гуманистическая педагогика: сущность, принципы, направления**

**Резюме**

Гуманистическая педагогика подразумевает отношение, направленное к личности, уважение и доверие, достойное отношение к ней, принятие ее личных целей, потребностей и интересов. Это связано также с развитием умений и способностей обучающихся, со стремлением всестороннего обеспечения их потребностей в повседневной жизни.

В статье большое место отведено ряд направлениям гуманистического подхода к педагогическому процессу, таким как выражение высокого отношения к национальным и общечеловеческим ценностям; уважение детских прав и свобод; охрана здоровья и безопасности обучающихся; выражение заботы и уважения к окружающей среде и к людям; оказание педагогической поддержки; обеспечение толерантности и терпеливости и педагогическое сотрудничество, широко освещено ожидание ряд условий в педагогическом процессе.

**M.Ilyasov**

**Humanist pedagogy: essence, principles, directions**

**Summary**

Humanist pedagogy is about turning to the personality, trust and respect to it, dignified relationship, accepting its personal aims, demands and interests. This is also about development of skills and ability of those who gets the education, and meeting the demands of their daily life.

This article deals with several directions of humanist approach to pedagogical processes-highly appreciation of national and universal values, respect to children rights and freedom, providing health and security of students, care and respect to environment and humanity, pedagogical support, providing tolerance and endurance, pedagogical cooperation and meeting several requirements in pedagogical process.



# TƏLİMDƏ TƏTBİQİ MƏQSƏDİN AYRILMASININ ZƏRURİLİYİ VƏ PEDAQOJİ BAXIMDAN ƏSASLANDIRILMASI

**Azadxan Adıgözəlov,**
***ADPU-nun “Riyaziyyat və onun tədrisi metodikası” kafedrasının müdiri, pedaqogika üzrə elmlər doktoru, professor***

***Açar sözlər:*** *riyaziyyat, tədris, tətbiq, məqsəd, üsul, forma, vasitələr.*
***Ключевые слова:*** *математика, обучение, применение, цель, метод, форма, средство.*
***Key words:*** *mathematics, teaching, application, goal, method, form, means.*

Tədris metodikası təlimin məqsədləri, məzmunu, metodları, vasitələri və formalarının işlənib hazırlanması ilə məşğul olur. Tədrisdə istifadə olunan komponentlər tam bir metodik sistem əmələ gətirir. Bu sistemdə təlimin məqsədləri digər komponentlərlə vəhdətdə təlimin aparıcı istiqamətini müəyyən edir. Riyaziyyat təliminin məqsədləri digər komponentlərlə aşağıdakı münasibətdədir.




Konkret mənada, riyaziyyat təliminin komponentləri arasında onun məqsədləri (təhsil, tərbiyə, inkişaf) mühüm rol oynayır. Son illərdə Respublikamızda təhsilin yenidən qurulması, təkmilləşməsi və Avropa təhsil sisteminə inteqrasiya edilməsi ilə əlaqədar ümumi orta təhsilin məzmunu xeyli dəyişmişdir. Təlimin məqsədinin dəyişməsi yalnız onun məzmununa deyil, digər komponentlərin, o cümlədən təlimin metodları və vasitələrinin dəyişməsinə səbəb olmuşdur. Konkret olaraq bu ümumtəhsil məktəbləri üçün yeni riyaziyyat dərsliklərinin yaranmasında, yeni texnologiyaların işlənib hazırlanmasında və tətbiq edilməsində, təlimin yeni vasitələr sisteminin (xüsusən, təlimin kompüterləşməsi ilə əlaqədar) yaradılmasında özünü göstərmişdir. Məsələnin izahını bir fənn üzrə qurmaq üçün aşağıdakı izah kifayət edir. Riyaziyyat təliminin məqsədləri ümumtəhsil məktəblərin “Riyaziyyat fənn kurikulumunda” aşağıdakı şəkildə verilmişdir. “İnsanlara həyatda, praktikada lazım olan hesablama vərdişləri aşılamaq, riyazi metodlardan istifadə etməklə həm elmi, həm də tətbiqi əhəmiyyətli məsələləri həll etməyi bacarmaq, digər fənlərlə yanaşı şagirdlərdə düzgün elmi dünyagörüşü formalaşdırmaq, onların təfəkkürünü və nitqini inkişaf etdirmək” [1; 3].

Riyaziyyat elminin müasir vəziyyəti onun tətbiqlərinin genişlənməsi ilə səciyyələnir. Mühüm tətbiqləri olan riyaziyyat digər elmlərin öyrənilməsinə xidmət edir. Riyazi metodların tətbiqi genişlənir, riyaziyyat bütün təbiət elmlərinin və texnikanın dilinə çevrilmişdir. Belə vəziyyətdə riyaziyyatın cəmiyyətdə rolu durmadan artır. Bu ilk

növbədə ümumtəhsil məktəblərində riyaziyyatın öyrənilməsinə aiddir. Məktəb riyaziyyat kursunun praktik əhəmiyyəti onunla əlaqədardır ki, onun obyekti həqiqi aləmin fəza formaları və miqdar nisbətləridir. Riyazi hazırlıq müasir texnikanın quruluşunu və istifadə olunması prinsiplərini başa düşmək, elmi və texniki anlayışları, ideyaları dərk etmək üçün zəruridir. Riyaziyyat insanların gündəlik fəaliyyəti üçün çox mühümdür. Riyaziyyat bilavasitə cəmiyyətin istehsal qüvvəsinə çevrilir. Riyaziyyatın köməyi ilə təbiətdə və cəmiyyətdə baş verən bir çox hadisələr və proseslər modelləşdirilir, öyrənilir və proqnozlaşdırılır. Ölkənin elmi, istehsal, iqtisadi və müdafiə potensialı orta məktəb məzunlarının riyazi hazırlığının keyfiyyə-tindən bilavasitə asılıdır.

Riyaziyyat orta məktəbdə dayaq fənlərindən biridir. O, digər fənlərin öyrənilməsini təmin edir. Bu ilk növbədə təbiət elmləri silsiləsindən olan fənlərə, xüsusən, fizikaya, informatikaya və hesablama texnikasının əsaslarına aiddir. Riyaziy-yatın təlimində şagirdlərin məntiqi təfəkkürünün inkişafı humanitar silsilədən olan fənlərin öyrənilməsini təmin edir. Şagirdlərin riyazi xarakterləri praktik bacarıqları və vərdişləri onların əmək və peşə hazırlığı üçün zəruridir.

Şagirdlərdə riyaziyyatın tətbiqi haqqında təsəvvürlərin inkişafı, riyazi mücərrədləşdirmənin mahiyyəti və əmələ gəlməsi, real ilə idealın münasibətləri, real aləmin hadisələri və proseslərinin riyaziyyat elmində əks olunmasının xarakteri, riyaziyyatın elmlər sistemində yeri və elmi idrakda və praktikada riyazi modelləşdirmənin rolu şagirdlərin elmi dünyagörüşünün formalaşmasına imkan verir.

Riyazi metodlar mexanika, fizika, astronomiya və b. elmlərin təbiət qanunlarının mahiyyətinə nüfuz etməsinə və hələ elmi biliklərdən kənarda qalanları da qabaqcadan görməyə imkan vermişdir. Məsələn, mexanika qanunları və riyazi metodlar U.Leverye və D.Adamsa (XIX əsr) sonralar isə P.Lovellə (XX əsr) Saturn planetindən sonra daha iki yeni - Neptun və Pluton planetin varlığını nəzəri əsaslandırmağa kömək etmiş, yalnız bundan sonra astronomik müşahidələr həmin planetlərin varlığını təsdiq etmişdir.

Riyazi fizikanın metodları K.Maksveli işığın təzyiqinin olması haqqında nəticə çıxarmağa imkan vermişdir. Bundan sonra P.N.Lebedev Maksvelin proqnozunu bir sıra dəqiq eksperimentlərin köməyi ilə təsdiq etmİşdir.

Müxtəlif növ həndəsi fəzalar /afin, sonlu ölçülü metrik fəza, hilbert fəzası və s. haqqında təlim elektrodinamika və nəzəri elektrotexnikada tətbiq olunur. Bununla yanaşı, riyaziyyat yalnız təbiətşünaslığın ayrı - ayrı məsələlərinin öyrənilməsinə kömək etmir, o, həmçinin nəzəriyyənin formalaşması və inkişafına imkan yaradır. Riyaziyyat kvant mexanikasının əsas tənliklərini müəyyən etməyə (P.Dirak və b.) kömək etmişdir ki, bundan sonra onların fiziki mənalarını da açmaq mümkün olmuşdur.

Riyaziyyatsız texnika inkişaf edə bilməz. Akademik A.N.Krılov riyaziyyatın tətbiqi əhəmiyyətini yüksək qiymətləndirərək çilingər üçün yeyə, çəkic və ştangel, dülgər üçün balta və mişar zəruri ələt olduğu kimi hər bir mühəndisə riyaziyyatın vacibliyini qeyd etmişdir. Riyaziyyatın digər elmlər içərisində ən mücərrəd elm olmasına baxmayaraq onun praktika ilə əlaqəsi daha möhkəmdir. Riyazi nəzəriyyənin praktika ilə əlaqəsinin məhsuldarlığı haqqında akademik P.L.Çebışev "Coğrafiya xəritələrinin çəkilməsi" əsərində yazmışdır: "Nəzəriyyənin praktika ilə yaxınlaşması ən yaxşı nəticələr verir; bundan yalnız praktika udmur; elmin özü onun təsiri altında inkişaf edir; o tədqiqat üçün yəni obyektlər və bu obyekt-

lərdə çoxdan məlum olan tərəflər açır” [5].

İqtisadiyyat, texnika, kənd təsərrüfatı təcrübəsi, bioloji, tibb və bir çox başqa elmlərin tələbləri, kosmik aləmə nüfuz və onun öyrənilməsinə cəhd göstərilməsi, təbiətin mühafizəsi yeni - yeni problemlər meydana çıxarmışdır ki, onları riyaziyyatın köməyi olmadan həll etmək mümkün deyildir.

Orta ümumtəhsil məktəblərində riyaziyyatın təlimi prosesində onun tətbiqi funksiyası özünü digər məktəb fənlərində müxtəlif formalarda göstərir. Müasir təbiət elmləri qarşısında duran mühüm problemlərin həllində riyazi nəzəriyyədən və metodlardan istifadə etməli olur. Qoyulan məsələlərin riyazi modellərinin düzgün qurulması və analizi ancaq riyaziyyat elminin üzərinə düşmür. Buna digər elmlərin də köməyi lazımdır. Bunun üçün tədricən bütün elmlər arasında oxşarlıq, əlaqəlilik yaranır. Vaxt ilə differensasiya nailiyyətlərinin məhsulu olan elmlərdən biri kibernetikadır. Norbert Vinerə görə, kibernetika, canlılarda və maşınlarda əlaqə və idarəetmə haqqında elmdir. Kibernetikanı bəzən avtomatik qurğular nəzəriyyəsi, bəzən riyazi hesablayıcı maşınlar haqqında nəzəriyyə, bəzən də avtomatlaşdırmanın əsasları adlandırırlar.

Hər hansı bir prosesin modelini verərkən analogiya və riyazi metoddan istifadə etməklə bərabər, öyrənilən hadisənin özünün də nəzəri əsasını bilmək lazımdır. Doğurdan da, maddələrin mexaniki xassələrini modellər vasitəsilə izah etmək üçün, birinci növbədə maddənin təbiəti, hansı qanuna tabe olduğu, başqa maddələrlə oxşar və fərqli cəhətləri, nəhayət, riyazi asılılığı təyin edilir.

Son zamanlar fiziki proseslərin tədqiqində modelləşdirmə metodu səmərəli bir vasitə olmuşdur. Bu metodun üstünlüyü ondan ibarətdir ki, aparılmış ayrı - ayrı təcrübələrin nəticəsindən buna oxşar bir qrup hadisələrin öyrənilməsində istifadə etmək mümkündür. Modelləşdirmə fiziki proseslərdə, habelə texnikanın bütün sahələrində tətbiq edilir. Əslində bu metod oxşarlıq nəzəriyyəsinə əsaslanmışdır. İki obyekt arasında oxşarlıq qoyula bilərsə, onda onlar arasında orijinal və model münasibəti mövcuddur.

Riyazi modelin başqa modellərdən bir sıra fərqi vardır. Sistemlərin riyazi modeli, onun hər hansı bir formal dildə təsviridir. Hesablamaların aparılması və bununla miqdar qanunauyğunluğun müəyyən olunması modelin yaranması üçün zəruri şərtdir. Riyazi modelləşdirmə üç mərhələdən keçir:

a) riyazi modelin qurulması;

b) öyrənilən prosesi modelləşdirən alqoritmlərin tərtib edilməsi;

v) modelin və öyrənilən proseslərin müəyyən olunması.

İstənilən model kimi, riyazi model də təkmil olmayıb öyrənilən prosesin yalnız bir tərəfini təsvir edir. Tətbiq edilən riyazi modellər nə qədər mürəkkəb olarsa, riyazi qurmaların mücərrədlik səviyyəsi nə qədər yüksək olarsa, obyektiv reallığın öyrənilməsinə riyazi metodların tətbiq edilməsinin effektivliyi bir o qədər yüksək olar.

Genetikanın bir çox müddəallarının işlənib hazırlanmasında riyazi və kibernetik ideyalar müvəffəqiyyətlə istifadə olunur. Formal riyazi aparatın köməyi ilə öyrənilən hadisələr arasındakı mühüm əlaqələri əks etdirən ilkin təsəvvürlər sistemi fərziyyə (hipotez) qurulur.

Məktəb riyaziyyatı həmişə politexnik təhsilin bünövrəsi olmuşdur. Birbaşa ənənəvi riyaziyyat kurslarına əsaslanan “İnformatika” fənninin daxil edilməsi məktəb riyaziyyatı silsiləsindən olan fənlərin tətbiqi və politexnik potensialının əhəmiyyətli dərəcədə artırmışdı.

Yuxarıda deyilənlərdən belə qənaətə gəlmək olar ki, müasir orta məktəbdə riya-

ziyyat təliminin tətbiqi məqsədi daha aydın şəkildə göstərilməlidir. Riyaziyyat təliminin məqsədləri ümumdaktik məqsədləri əks etdirməli və bununla yanaşı tədris fənninin səciyyəvi xüsusiyyətlərini nəzərə almalıdır. Lakin təlim prosesinin müasir didaktik nəzəriyyəsində (Skatkin N.M., Lerner İ.Y., Krayevski V.V. və b.) onun üç müstəqil (təhsil, tərbiyə və inkişaf) məqsədi ayrılmışdır. Çox vaxt praktik adlanan tətbiqi məqsəd digər məqsədlər daxilində qeyri - aşkar şəkildə ifadə olunmuşdur. Buna baxmayaraq riyaziyyatın səciyyəvi xüsusiyyətindən asılı olaraq onun tətbiqi istiqaməti məsələsi metodik tədqiqatlarda kifayət qədər geniş şəkildə işlənilmişdir.

Riyaziyyat təliminin təhsil, tərbiyə və inkişaf məqsədləri ilə yanaşı tətbiqi məqsədi müxtəlif baxışlarına çoxlu sayda tədqiqat işləri həsr olunmuşdur. Həmin işlərin təhlili onları aşağıdakı istiqamətlərdə qruplaşdırmağa imkan verir:

- riyaziyyat təliminin həyatla və istehsalatla əlaqəsi;
- riyaziyyat təliminin orta məktəbdə və texniki peşə məktəbində əmək tərbiyəsi və peşə təlimi ilə əlaqəsi;
- fənlərarası əlaqə problemi (riyaziyyatın informatika, fizika, kimya biologiya, rəsmxət, coğrafiya, astronomiya və s. fənlər ilə əlaqəsi);
- riyaziyyatda politexnik təhsil problemi;
- riyaziyyata onun tətbiqi xarakterini təmin edən ayrı - ayrı metodik - məzmun xəttin daxil edilməsi (alqoritmik mədəniyyətin formalaşması, şagirdlərin konstruktiv - həndəsi inkişafı, onların fəza təsəvvürlərinin güclənməsi və s.) ;
- orta məktəblərin xüsusi siniflərində və ya peşə məktəblərində, dərnək, maraq məşğələlərdə öyrənilən xüsusi tətbiqi riyaziyyat kursların işlənib hazırlanması və s.

Riyaziyyat təliminin tətbiqi istiqamətinin gücləndirilməsi ilə əlaqədar problemin müxtəlif baxışlarına aid tədqiqat istiqamətlərinin rəngbərəngliyi və çoxsaylı olması onun bütövlükdə öyrənilməsinə daha geniş mənada baxmağın zəruriliyini göstərir. Həmin tədqiqatlar problemin ayrı - ayrı baxışlarının öyrənilməsinə istiqamətlənmişdir. Fikrimizcə, bizdən əvvəl aparılmış tədqiqatların nöqsanı riyazi biliklərin tətbiqinin öyrənilməsi probleminin tədqiqinə vahid nəzəri yanaşmanın olmamasından irəli gəlmişdir. Bu da öz növbəsində riyaziyyat təliminin tətbiqi funksiyasının ayrılması ilə izah edilə bilər. Qeyd edildiyi kimi, məhz bunun nəticəsidir ki, problemin ayrı – ayrı baxışlarına həsr olunmuş tədqiqatlar, bir qayda olaraq, bir-birindən təcrid olunmuşdur. Nəticədə, tətbiqi funksiyanın öyrənilməsi, tədqiq edilməsi tam olmamışdır. Fikrimizcə, orta məktəbin riyaziyyat kursunun formal qalmasının bir səbəbi də məhz bundan ibarətdir.

Məktəb riyaziyyat kursunun bir sıra tədris fənləri, bölmələri və mövzularının tətbiqi məsələsi indiyə qədər öyrənilməmiş qalmışdır. Bir çox mövzuların çalışmalar sistemi formaldır. Onlarda, demək olar ki, tətbiqi istiqamətli çalışmalar dərəcəsindədir. Riyaziyyat kursu informatikadan kifayət qədər istifadə etmir. Ümumiyyətlə, əksər şagirdlərin hesablama vərdişləri dözülməz dərəcədə aşağı səviyyədədir. Riyaziyyat təliminin bir çox fənlərlə əlaqəsi öyrənilmir. Fizika ilə əlaqə, bir çox hallarda pozulmuşdur. Riyazi faktlar kafi və yaxşı mənimsəyən şagird öz biliklərini riyaziyyat daxilində tətbiq etməyi bacardığı halda, riyaziyyatdan kənarda onları tətbiq etməkdə aciz qalırlar. Məktəb riyaziyyat kursunun tətbiqi funksiyasının kafi şəkildə öyrənilmədiyi indi artıq orta və ali məktəb müəllimlərinə, ictimaiyyətə yaxşı məlumdur.

Riyaziyyat təliminin tətbiqi məqsədinin öyrənilməsi ilə əlaqədar problemin tam

şəkildə işlənməməsi, fikrimizcə, öz əksini müasir təlim tərbiyə prosesinə məxsus obyektiv ziddiyyətdə tapır.

Bir tərəfdən, riyaziyyatın müasir həyata nüfuz etməsi, insan fəaliyyətinin bir çox müxtəlif sahələrinin riyaziləşməsi, riyazi fəaliyyətə günbəgün daha çox sayda mütəxəssislərin cəlb edilməsi orta məktəbdən şagirdlərdə riyazi bilik, bacarıq və vərdişləri tərbiyə etməyə hazırlığın formalaşmasını tələb edir. Digər tərəfdən, təlimin məhz bu tərəfi əhəmiyyətli dərəcədə əziyyət çəkir. Əldə edilən biliklər belə hazırlığı təmin etmir. Şagirdlərdə biliklərin tətbiqi aparatı yolverilməz dərəcədə aşağı səviyyədə formalaşır.

Bütün bu deyilənləri nəzərə alaraq, şagirdlərdə ümumi və peşə təhsilini, özünütəhsili davam etdirməyin formalaşmasını tələb edən fasiləsiz təhsil konsepsiyasının praktik həyata keçirildiyi şəraitdə mühüm pedaqoji vasitə kimi fənlərarası əlaqələrdən geniş istifadə əsasında riyazi təhsilin mühüm səciyyəvi və müstəqil məqsədi kimi məktəb riyaziyyat kursunun tətbiqi funksiyasının ayrılması, tədqiq edilməsi və öyrənilməsi xüsusilə aktuallıq təşkil edir.

Ümumtəhsil məktəblərində riyaziyyat təliminin tətbiqi funksiyası dedikdə təlimin aşağıdakılardan ibarət olan qlobal didaktik məqsədini başa düşürük:

- canlı və inkişafda olan, müasir həyada və insan fəaliyyətinin bir çox sahələrində mühüm əhəmiyyəti olan elmi kimi riyaziyyat haqqında şagirdlərdə təsəvvürlərin formalaşması;
- şagirdlərin riyazi fəaliyyət metoduna qoşulması;
- əhəmiyyətli dərəcədə riyaziyyata əsaslanan sahələrdə təhsili davam etdirməyə hazırlığın formalaşması;
- riyaziyyat sahəsində müstəqil tədris fəaliyyəti bacarıqları və vərdişlərinə yiyələnmə.

Ənənəvi yanaşmadan fərqli olaraq riyaziyyat təliminin tətbiqi funksiyası anlayışına məktəb riyaziyyat kursunun uşaqlar və yeniyetmələrin tədris fəaliyyətinin bütün sahələri, onların əmək fəaliyyəti və məişəti və metodoloji və məzmunlu əlaqəni aid edirik.

Təlimin tətbiqi funksiyasının belə geniş mənada başa düşülməsində riyaziyyatın müasir həyatda rolu haqqında şagirdlərdə təsəvvürlərin formalaşmasının, insan fəaliyyətinin çox müxtəlif sahələrində riyazi biliklərin tətbiqi metodlarına yiyələnməyin də mühüm əhəmiyyəti vardır.

- formal - məntiqi qurulma kimi riyazi biliklərin səciyyəsi;
- tətbiqi riyaziyyatın metodları;
- tədris situasiyalarını riyazi modelləşdirmənin tətbiqi imkanları.

Riyaziyyat təliminin tətbiqi funksiyasının ayrılması və müstəqil tədqiq edilməsi, təlim tərbiyə prosesində bu funksiyanın öyrənilməsinin xüsusi nəzərə çatdırılması riyaziyyatın öyrənilməsini şagirdlər üçün əsaslandırılmış prosesə, riyazi biliklərin tətbiqinə hazırlığın formalaşması isə riyaziyyata yiyələnmə prosesinin, bütövlükdə riyazi tərbiyənin mühüm üzvi hissəsinə çevrilən pedaqoji situasiyanın yaradılmasına gətirir.

Təlim - tərbiyə prosesinin belə qoyuluşu yalnız biliklərin geniş fəaliyyət göstərməsinə deyil, həm də bütövlükdə riyaziyyatın daha möhkəm və qeyri - formal mənimsənilməsinə səbəb olur, şagirdlərdə riyazi biliklərin məzmununa marağın artmasına müsbət təsir göstərir.

Beləliklə, riyaziyyat təliminin tətbiqi funksiyasına ənənəvi kök salmış yanaşmadan fərqli olaraq müasir yanaşmaların inki-

şafı və elmi ümumiləşməsindən ibarət tamamilə yeni konsepsiya kimi baxırıq. Bu konsepsiyanın mahiyyəti riyaziyyat təliminin tətbiqi funksiyasının öyrənilməsinin zəruriliyi, pedaqoji məqsədəuyğunluğu və müstəqil səciyyəvi funksiya kimi ayrılmasının praktik səmərəli göstərilməsindən və vahid təlim tərbiyə prosesinin təhsil, tərbiyə və inkişaf funksiyaları ilə yanaşı, onlarla üzvi vəhdətdə nəzərdən keçirilməsindən ibarətdir.

***Rəyçi: prof. İ.İsmayılov***

## İstifadə edilmiş ədəbiyyat

1. Ümumtəhsil məktəblərin riyaziyyat fənn kurikulumu. Bakı, 2010.
2. Ağayev B., İbrahimov Ə. Səkkizillik məktəbdə riyaziyyatın tədrisi metodikası. Bakı: Maarif, 1972.
3. Adıgözəlov A. Orta məktəbdə riyaziyyatın tədrisi metodikası. Bakı: ADPU, 2015.
4. İbrahimov F. Ümumtəhsil məktəblərində riyaziyyatın tədrisi metodikası. Bakı: Mütərcim, 2016.
5. Əliyeva T., Adıgözəlov A., Mütəllimov T. Orta məktəbdə riyaziyyatın tədrisi metodikası. Bakı: ADPU, 1993.
6. Paşayev Ə., Rüstəmov F. Pedaqogika. Yeni kurs, Bakı, 2002.
7. Veysova Z. Fəal (interaktiv) təlim: Müəllimlər üçün vəsait. Bakı: Unisef, 2007.

**А.Адыгёзалов**

**Цели применения учебной программы на курсах преподавания математики в школе, а также ее обоснование с педагогической точки зрения**

**Резюме**

Среди компонентов обучения математике основную роль играют его прикладные цели. В связи с реформами в образовании содержание общего изменилось. Но изменения в целях образования оказало влияние не только на его содержание, но и на другие компоненты, в частности, на методы и средства обучения.

**A.Adigozalov**

**The objectives of the curriculum application in the courses of teaching mathematics in the school, as well as its justification from the pedagogical point of view**

**Summary**

Among the components of teaching mathematics the primary role belongs to its applied goals. Due to the reforms in education, the content of general secondary education has changed. But changes in the goals of education have had an impact not only on its content, but also on other components, particularly on methods of the means of instruction.



# İNSANIN SOSİALLAŞMASININ PEDAQOJİ VƏ PSİXOLOJİ PARAMETRLƏRİ

**Sahil Cəfərov,**
***Lənkəran Dövlət Universitetinin baş müəllimi, pedaqogika üzrə fəlsəfə doktoru***

***Açar sözlər:*** *sosiallaşma, sosiallaşma faktorları, ünsiyyət potensialı, sosial-psixoloji səciyyə, qarşılıqlı münasibətlər sistemi.*

***Ключевые слова:*** *социализация, факторы социализации, потенциал общения, социально- психологический фактор, система взаимных отношений.*

***Key werds:*** *socialization, socialization factors, communication potential, social- pedagogical feature, mutual.*

Sosiallaşma çox mürəkkəb, rəngarəng və rəngarəng olduğu qədər çətin prosesdir. Bu prosesin ilkin elementləri qarşılıqlı münasibətlər şəraitində ictimai dəyərlərin əldə olunması tendensiyasında üzə çıxır. İnsan amili ictimai dəyərlər qazandıqca cəmiyyətə inteqrasiya olunur və beləliklə də cəmiyyət üzvləri arasında əhəmiyyətli dərəcədə eyniyyətin yaranmasının ilkin elementləri formalaşmağa başlayır. Cəmiyyətin inkişafı isə yalnız onun üzvləri arasında sağlam münasibətlər şəraitində reallaşa bilir. İnsanın qarşılıqlı münasibətlər şəraitində formalaşması prosesi qeyri-şərtsiz olaraq sosiallaşma prosesinin genişhüdudlu əhatə dairəsinin tərkib elementinə çevrilir. Deməli, sosiallaşma prosesi başlıca olaraq mənəvi-psixoloji və sosial-pedaqoji şərtlərlə xarakterizə olunan uzunmüddətli bir tendensiyadır. Məqalənin tədqiqi predmetinə uyğun olaraq deyə bilərik ki, soiallaşma aktının pedaqoji və psixoloji parametrlərinin araşdırılması ilk növbədə uşaqlarla sosial-pedaqoji işin aparılmasında yeniliklərin əldə olunmasına potensial töhfələr verəcək.

Bu bir həqiqətdir ki, mənəvi-psixoloji resurslar şəxsiyyətin tipalogiyasında yalnız perspektivli yer tutduqdan sonra cəmiyyətdə sosial-iqtisadi və elmi-texniki tərəqqinin geniş sosial-psixoloji və pedaqoji potensialları formalaşır.

İnsanın ictimai münasibətlər sistemində iştirakını ilkin mərhələdə onunla ətraf aləm arasında yaranan daxili psixoloji vasitələr şərtləndirir. Bunu elmşünaslıqda sosiallaşma aktının “daxili psixoloji vasitəsi” kimi adlandırmaq olar. Həmin vasitələrin ilkin elementləri duyğu üzvlərinin sosial imkanları səviyyəsində üzə çıxır. Çünki ictimai münasibətlər sferasına daxil olan insan ilkin mərhələdə ətraf aləmdə baş verən hadisələri duyğu üzvləri vasitəsilə hiss etməyə çalışır; faktları seçir, toplayır, təfəkkür süzgəcindən keçirir və müvafiq ictimai dəyərlərin “yenidən istehsalını” reallaşdırmaq üçün həmin faktlar barədə məlumatların çox böyük və tükənməz axınını qəbul edən və onu ictimai keyfiyyətlərin təşəkkülü səviyyəsində təhlil etmə qüdrətinə malik olan beyinə ötürür. Bu tendensiyanın nəticəsində ictimai münasibətlər şəraitində insan psixologiyasının ətrafdakı fakt və

hadisələrə adekvat inikası baş verir və bunun əsasında icraedici funksyalara daxil olan, davranışın psixi modelini yaradan sinir implusları formalaşır. Sosiallaşma aktında müxtəlif əməliyyatların icrasından ibarət olan mürəkkəb psixi mexanizm fasiləsiz iş rejimində fəaliyyət göstərir. Hiss üzvləri ictimai mühitin insan şüuruna nüfuz etməsində psixoloji səbəblər törədən sosial kanalların məcmusudur. Bu mənada hiss üzvləri insan amilinə onu əhatə edən ictimai mühitə bələdləşmək imkanlarını qazandırır. Elmi psixologiyada qeyd olunduğu kimi, əgər insan bütün hiss üzvlərindən məhrum olsaydı, o, özünün ətrafında nələr baş verdiyini bilməzdi, onu əhatə edən adamlarla ünsiyyətə girməyə müvəffəq olmazdı [8, s.102].

Sosiallaşma prosesini şərtləndirən əsas cəhətlərdən biri də insanla onun qarşılaşdığı mühit arasında məlumatlılıq faizinin kifayət həddə olmasıdır. Çünki insan amilinin ictimai mühitə inteqrasiyası bilavasitə ictimai mühitlə onun arasında müyyən dəyərlər balansının mövcud olması ilə xarakterizə olunur. İnsanla cəmiyyət arasında dəyərlər balansının formalaşması naminə prestij təəssuratların əldə olunma tələbatının reallaşmasında  duyğu üzvlərinin vasitəlik səviyyəsinin nə qədər önəmliliyi dərhal gözə çarpır. İnsanın duyğu üzvlərinin sosial-psixoloji xüsusiyyəti ondadır ki, duyğular insan faktorunu baş verən hadisə və proseslər barədə obyektiv məlumatlarla təmin edir. Məsələn,  görmə duyğusu vasitəsi ilə insan baş verən hadisələrin canlı müşahidəçisinə çevrilirsə eşitmə reseptorları həmin hadisələrin başvermə səbəblərini araşdırmaqda ona yardımçı olur; digər misalda, əgər iybilmə, dadbilmə və lamisə predmetlərin xassələrinin bizə anladılmasında yardımçı olurlarsa deməli, cism və hadisələrin əlamətlərini, ictimai situasiyaların başvermə səbəblərini bizə təqdim etməkdə duyğu üzvləri çox dəqiq şəkildə ixtisaslaşmışdır. Şəxsiyyətin cəmiyyətə adaptasiyasında o zaman uğurlu nəticə əldə olunur ki, duyğu üzvləri fakt və hadisələrin obyektiv xassələrini müvəffəqiyyətlə əks etdirsin. Çünki duyğuların spesifikliyi ictimai mühitdə baş verən hadisələrin özünəməxsusluğu ilə bilavasitə transformasiya olunur. Duyğuların sosial mahiyyəti o cəhətlərdə təsdiq olunur ki, bu proseslər insanın iradəsindən asılı olmadan baş verdiyi şəraitdə onun (insanın) mövqeyini (qəbul edir və ya etmir, özünə məqbul sayır, ya da saymır) nəzərə almadan reallaşır. İnsan istər-istəməz emosional vəziyyətlərə düşür; özünü baş verən fakt və hadisələrin fəal üzvünə çevrilmə təhlükəsindən sığortalasa da həmin hadisələr onun hafizəsində dərin psixoloji izlər buraxır və beləliklə, gələcək fəaliyyətində müvafik şərait yaranan kimi insan psixologiyasında keçmişdə qazanılan mənfi emosialar onun davranışında dominant səviyyəyə çevrilir. Duyğular maddi aləmin  subyektdən asılı olmadan baş verən fakt və hadisələrinin həqiqi xassələrini özündə əks etdirirlər. Bu baxımdan duyğuların sosiallaşma prosesinin hərəkətverici mənbələrinə çevrilməsindən ötrü qarşılıqlı münasibətlər şəraitində insanın subyektivliyi çox vacibdir. Sosiallaşmanın tamlığı həm daxili psixi, həm də xarici hərəkətlərdə öz dolğun ifadəsini tapır.

Sosiallaşma prosesində yaranan qarşılıqlı münasibətlər şəraitində baş verən situasiyalar zamanı reseptorlara təsir edən ictimai qıcıqlandırıcıların spesifik enerjisinin sinir implusları enerjisinə çevrilməsi nəticəsində yeni yanaşma modeli formalaşır. Bu fakta

əsasən belə bir elmi qənaətə gəlmək olar ki, duyğu təkcə hissi surətin komponenti deyil, o həm də sosiallaşma prosesinin fəal tərkib elementidir.

Sosiallaşmanın psixoloji mexanizminin təhlilinin əhəmiyyəti həm də ondadır ki, bu araşdırma cəmiyyətin inkişafının müasir mərhələsində sosiallaşmanın psixoloji tendensialarını, onun müsbət və ya mənfi imkanlarını, müsbət imkanların daha dərindən ifadə olunması yollarını, mənfi imkanların qarşısının alınması və kompensasiya edilməsi vasitələrini müəyyənləşdirməyə şərait yaradır. Bu istiqamətdə əsas bilgilərin əldə olunması həm də insanlarla sosial-psixoloji işin aparılmasının universal modelinin yaradılmasına çox böyük fayda verəcək.

İnsanın qarşılaşdığı situasiyalarda duyğular ictimai qıcıqlandırıcıların təsirindən sonra dərhal yaranmadığı kimi, situasiya kəsildikdən sonra da dərhal yox olmur. Uşağın qarşılaşdığı situasiyalarda qazanılan təəssuratlar böyüklərə nisbətən qısamüddətli olur. Çünki yaşa dolduqca insanın həyat təcrübəsi artır, o artıq hadisə və prosesləri təkcə baxışları ilə müşahidə etmir, həm də şahidi olduğu fakt və hadisələr arasında yaranan səbəb nəticə əlaqələri təfəkkür süzgəcindən keçirir; qarşılaşdığı ictimai təsirlərin bəzilərini zəif, bəzilərini isə dominant səviyyədə qəbul edir. Böyüklər əksər hallarda qarşılaşdığı ictimai təəssuratların psixoloji zərbəsindən hələ uzun müddət qurtula bilmir.

Sosiallaşma prosesində ictimai təsirlərə məruzqalma tendensiyasında isə hasil olan nəticə təəssuratların yaranma tendensiyasının əks mütənasibliyini təşkil edir. Çünki bu prosesdə artıq uşaq yaşlarında qazanılan ictimai keyfiyyətlərin kəmiyyət və keyfiyyət göstəriciləri tamamilə fərqli müstəvidə cərəyan edir. Fakt və hadisələr uşaq yaşlarında qısamüddətli təəssuratlar yaratsa da bu tendensiya uşağın psixologiyasında köklü sosial-psixoloji dəyişikliklərin baş verməsi ilə nəticələnir. Burada böyüklərə nisbətən sosial təcrübənin az olması səbəbindən hadisələrin analizində buraxılan səhflər uşağın psixologiyasında keçilməz uçurumlar yaradır. Ona görə də yaşlılar qarşılaşdığı mənfi təəssuratların, azyaşlılar (uşaqlar, yeniyetmələr, gənclər) isə qazandıqları ictimai keyfiyyətlərin təsirindən çox gec qurtula bilirlər.

Sosiallaşmanın psixoloji təhlilində onu da qeyd etmək vacib sayılar ki, bu prosesdəki hadisələr iştirakçısıların psixologiyasında ilkin olaraq analizatorlara bir neçə saniyə ərzində təsir edir; səs implusları şəklində elementar təəssuratlar yaradır və qavrama mərhələsinə müvəffəqiyyətli keçid alınır. Situasiyada yaranan impulsun intensivliyi və uzunmüddətliyi qəbul olunan informasiyanın hansı həcmdə qavranılmasını bilavasitə şərtləndirir. İnsan psixologiyasında ictimai dəyərlərin qazanılması aktı məhz belə baş verir: müəyyən anda beyin qabığı daxil olan saysız-hesabsız impulslardan yalnız insanın fərdi-psixoloji xüsusiyyətlərinə müvafiq funksional əhəmiyyətə malik olanları qəbul etdiyi vəziyyətlərdə digər impulsların axınını dayandırır. Sosiallaşmanın psixoloji və pedaqoji xarakteristikasında proseslərin qeyd etdiyimiz səviyyədə cərəyan etməsi məqsədəuyğun və məqbul sayılır. Bu istiqamətlərdə tədqiqat aparan psixoloqların (6, səh.186) da fikirlərini ümumiləşdirsək belə bir elmi qənaətə gələ bilərik: sosiallaşma prosesində elə bir situasiya yoxdur ki, baş beyin yarımkürələri qabığı həmin situasiyada yara-

nan bütün impulsları eyni şəkildə qavrasın və yaranan münasibətlərə olan reaksiyaların kompleksliliyini eyni zamanda təmin etsin; şəxsiyyətin bu məqsədə meyilliliyi onun sosial-psixoloji tənəzzülü ilə və beləliklə sosiallaşmada böhran vəziyyətinin yaranması ilə nəticələnəcəkdir.

Psixologiyadan və anatomik-fizioloji tədqiqatlardan bizə məlumdur ki, baş beyin yarımkürələri qabığı orqanizmin həyati mənafeyi keşiyində durur və özünün oyanma həddini yüksəldərək lazımsız impulsları həddaltı impulslara çevirir, beləliklə də orqanizm gərəksiz reaksiyalardan azad olur [5, s.127].

Sosiallaşma aktının reallaşması həm də insan amilinin qarşılaşdığı situasiyalarda yaranan münasibətlər sisteminə iradi səyi sayəsində adaptasiyanın baş vermə səviyyəsi deməkdir. İstər sosial pedaqoqların, istərsə də sosial psixoloqların tədqiqatlarında adaptasiya anlayışı tez-tez işlədilir. Burada bir məsələ diqqət mərkəzində durur: adaptasiya nədir və onun pedaqoji- psixoloji təhlili necə təqdim oluna bilər?

Təbii haldır ki, insan amilinin sosiallaşması cəmiyyətdə baş verən sosial-iqtisadi və ictimai-siyasi dəyişikliklərə uyğunlaşması prosesidir. Sosiallaşma tendensiyasında adaptasiya həm də insanın qarşılıqlı münasibətlər şəraitində mövcud fakt və hadisələrə uyğunlaşması səviyyəsində təhlil olunur. Pedaqoji və psixoloji prizmadan yanaşdıqda adaptasiya insana istiqamətlənən ictimai amillər kompleksində yaranan qıcıqlandırıcıların təsiri prosesində duyğunun həssaslığı səviyyəsində reallaşır. Yəni qarşılıqlı münasibətlər şəraitində uşağın daxili psixoloji laylarında yeni situativ şərait yarada bilən davranış nümunəsi ilkin anda qabarıq duyğular oyada bilir; lakin eynilə təkrarlanan şəraitlərdə həmin hallarla dəfələrlə qarşılaşmaq nəticədə situativ duyğuları aşağı həddə endirə bildiyi hallarda sosiallaşma aktını reallaşdırır. Uşağın şahidi olduğu davranış nümunələri onun psixologiyasında yalnız duyğu yaratmamaq həddinə qədər sadələşəndən sonra sosiallaşma prosesinin tərkib elementinə çevrilə bilir. Bu prosesdə iradə və xarakterin rolu mühümdür. İradə daxili və xarici çətinliklərin aradan qaldırılmasından ötrü məqsədyönlü və şüurlu fəaliyyət olduğuna psixoloji cəhətdən sosiallaşma prosesinin mərkəzi nüvəsini təşkil edir. Ona görə də sosial-psixoloji işin əsas vəzifələrindən biri iradi keyfiyyətlərin formalaşdırılmasıdır. İradi səy əsasən adaptasiya aktının reallaşmasında mühüm şərtə çevrilir. Çünki adaptasiya insanın öz müəyyən istək və arzularını buxovlayaraq cəmiyyətə qovuşması prosesidir. İnsan heç zaman cəmiyyətlə qarşıdurma vəziyyətində qala bilməz. İnsan-cəmiyyət əlaqələrində əks qütblər üzrə yaranan münasibətlərin sonu mövqelərin qovuşması ilə yekunlaşmalıdır, yoxsa vahid cəmiyyət modeli yarana bilməz. Bu tendensiyada yalnız möhkəm iradə və xarakterin rolu üzə çıxır.

İradi xüsusiyyətlər insandan öz davranışını tənzim etməyi, bir sıra başqa istək və meyillərini ləngitməyi ona görə tələb edir ki, o, cəmiyyətə adaptasiya oluna bilsin. Deməli, iradə şüurlu olaraq qarşıya qoyulmuş məqsədlərə müvafiq müxtəlif canatmaların ardıcıl surətdə təhlilini və həyata keçirilməsini tələb edir. İradi keyfiyyətlər sayəsində sosiallaşma aktında insan bəzən öz şəxsi qeyri-ixtiyari impulslarını nəzarət altına alır və lazım olduqda onları cilovlamağı bacarır. Sosiallaşma şəxsiyyətin elə bir fəallıq formasıdır ki, şüur elementi orada mütləq iştirak edir. Çünki sosial keyfiyyətlər

sistemi ictimai şüurun ən yüksək nailiyyətidir. Bu mənada iradi hərəkətlərimiz şüurun nəzarəti olmadan ictimai keyfiyyətlər səviyyəsinə yüksələ bilməz.

İradi fəaliyyətin həm də sosiallaşmanın uğurluluğunu təmin edən tələbkarlıq kodeksi səviyyəsində qiymətləndirilməsi sosial-psixoloji baxımdan qəbulolunandır. Sosiallaşma prosesində bir sıra aktların və hərəkətlərin mövcudluğu zəruridir ki, orada şəxsiyyət öz səylərinin və icra olunan psixi proseslərin xüsusiyyətlərini geniş ölçüdə dərk edə bilsin. Bu tendensiyaya münasibətlərin gedişində yaranmış vəziyyətin qiymətləndirilməsi, aparılacaq təfəkkür əməliyyatları üçün müvafiq yolun tapılması, məqsədə nail olmaq üçün zəruri vasitələrin seçilməsi, qərar qəbulu və s. subyektiv yanaşmalar daxildir. İnsan psixologiyasında yaranan münasibətlər modelinin xarakterinə, seçilən yanaşma tərzinə təsir edən motivlər iyerarxiyasının əmələ gəlmə səbəbləri məhz onun iradi keyfiyyətləri ilə transformasiya olunur. Bu iyerarxiya şəxsiyyətin təşəkkülü prosesində yaşadığı cəmiyyətdə onun sosial inkişaf şəraitindən, ictimai dəyərlər kompleksindən və sərvət meyillərindən asılı olaraq əmələ gəlir. Xüsusi formada qeyd olunmalıdır ki, şəxsiyyətin sərvət meyilləri yaranan situasiyalarda müvafiq ictimai davranış formalarının psixoloji modelinin formalaşmasında təzahür olunur. İctimai davranışın psixoloji modelinin təşəkkülü nəticəsində və şəxsiyyətin sərvət meyilləri sayəsində insan amilinin gələcək fəaliyyətinin prioritetləri üzə çıxır. Bu keyfiyyətlər yalnız qarşılıqlı münasibətlər şəraitində sosial-psixoloji törəməyə çevrilərək davranışın tənzimlənməsini xarakterizə edir. Sosiallaşma prosesində dominant qəbul olunan davranış nümunələri istər-istəməz onun subyektiv yanaşma tərzində ifadə olunur. Bu prosesin psixi imkanları xarakterin mövcüd situasiyanın tələbləri səviyyəsində formalaşmasına qədər funksionaldır. Sosial-psixoloji situasiyalar şəxsiyyətin mahiyyətində, istiqamətində, məqsədlərində, meyillərində və emosional-hissi fəaliyyətində gözəçarpan dərəcədə dəyişikliklərin olunmasını zəruriyyətə çevirir. Çünki insan faktoru adaptasiya mərhələsini keçməyə müvəffəq olmadan sosiallaşa bilməz.

Sosiallaşma prosesini kollektiv, qrup formasında nəzərdən keçirmədən, bu istiqamətdə xarakterizə etmədən onun pedaqoji və psixoloji təhlilini vermək qeyri-mümkündür. Hələ eramızdan əvvəlki dövrdə böyük yunan alimi Platon belə bir fikir irəli sürürdü ki, ruhi aləmin hissləri insanlar arasında bərabər şəkildə bölünməmişdir və onlardan birinin digərlərinə nisbətən üstünlük təşkil etməsi fərdin bu və ya digər sosial qrupa mənsub olmasını müəyyən edir [11, s.112].

Cəmiyyətin inkişaf səviyyəsini həm də insan faktoru tərəfindən ayrı-ayrı qruplarda müxtəlif sosial funksiyaların yerinə yetirilməsi tendensiyası şərtləndirir. Bunun sosiallaşma baxımından iki mühum psixoloji əhəmiyyəti vardır: bir tərəfdən sosial fəaliyyət sistemində şəxsiyyətin obyektiv yeri müəyyənləşir, digər tərəfdən onun şüurunun sosial resurslarının formalaşması reallaşır. Bu prosesin qanunauyğunluqlarını aydınlaşdırmaq üçün hər şeydən əvvəl belə bir suala cavab vermək lazımdır ki, sosial-psixoloji mənada qrup insan faktoru üçün nə deməkdir, onun hansı xarakteristikaları qrupun hər bir üzvü üçün daha çox qəbul olunandır? Bu suala cavab verməkdən ötrü qrup anlayışını sosiallaşma aktının psixoloji xarakteristikası səviyyəsində təhlil etmək zəruridir.

Qrup anlayışına kəmiyyət nöqteyi nəzərdən yanaşdıqda, hər şeydən əvvəl qeyd etmək lazımdır ki, qrup dedikdə müəyyən bir sosial şəraitdə bir subyektin deyil, bir neçə subyektin iştirak etməsi nəzərdə tutulur. Lakin eyni sosial şəraitdə, məsələn, iki adamın sadəcə olaraq iştirak etməsi onları sosial-psixoloji cəhətdən qrup adlandırmaq üçün hələ kifayət etmir. Çünki, iki nəfərdən artıq adam qrup halında birləşəndə, onların hər biri müvafiq birgə fəaliyyətin iştirakçısına çevrilir, qrupun sosial inkişaf qanunları yaşamağa başlayır; hətta qrup üzvlərindən biri müəyyən səbəb üzündən təklikdə fəaliyyət göstərdikdə belə, qrupun digər üzvü onun xəyalında, adətən iş yoldaşı kimi iştirak edir. Beləliklə, artıq iki və daha çox adam qrup halında birləşəndə onların hər birinin fəallığında fərdin psixologiyası ilə izah edilə bilməyən yeni sosial cəhətlər meydana çıxır. Yeni qrup üzvlərinin sayı artdıqca kəmiyyət və keyfiyyət xarakteristikası arasında sosial-psixoloji balans yaranır. Buna uyğun olaraq ictimai keyfiyyətlərin həcmi çoxalır, fərdi yanaşma ümumi yanaşma modelinə inteqrasiya olunur, münasibətlər sisteminin vahid modeli formalaşmaya doğru istiqamət alır və cəmiyyətin digər tələbat və şərtlərinə müvafiq, müxtəlif parametrlər üzrə sosial rabitə yaranır. Aparılan araşdırmalar onu deməyə imkan verir ki, insan amilinin sosiallaşmasının intensivləşməsindən ən optimal səviyyə kollektiv və qrupun birgə fəaliyyəti şəraitində əldə olunur. Sosial psixoloqlar və pedaqoqlar əsasən bu qənaətə gəlirlər ki, iki nəfərdən artıq adam qrup halında birləşəndə onlardan hər birinin fəallığında elə cəhətlər meydana çıxır ki, bunları təkcə fərdin psixologiyası ilə deyil, əsasən qrupun sosial- psixoloji və pedaqoji qanunauyğunluqları ilə yerinə yetirmək mümkün olur [11, s.183].

Qrupun sosial-pedaqoji xarakteristikasında qarşılıqlı münasibətlərin hansı pedaqoji şərtlərlə qurulması yolları aşkarlandığı halda, sosial-psixoloji təhlilində bu münasibətlər insan psixologiyasının sosial törəməsi səviyyəsində xarakterizə olunur. Çünki qrup özünəməxsus sistemdir və müəyyən struktura malikdir. Qrupa daxil olan hər bir adam müəyyən rol və vəzifə ifadə edir. Hər bir qrup özünün məqsədlərinə, normalarına, sərvət meyillərinə, sosial gözləmələrinə və s. müvafiq olaraq müxtəlif formalarda öz üzvlərinə nəzarət edir: onları rəğbətləndirir və ya cəzalandırır. Qrup üzvləri müvafiq normaları və sərvət meyillərini mənimsədikcə sosial-psixoloji və pedaqoji cəhətdən qrupun həyatında köklü dəyişikliklər əmələ gəlir: qrup üzvlərində qrupa mənsubluq hissi əmələ gəlir. Bunun psixoloji cəhətdən ilk əlaməti ondan ibarətdir ki, qrupun hər bir üzvü qrupun nailiyyətlərini öz nailiyyətləri, müvəffəqiyyətsizliyini isə öz müvəffəqiyyətsizliyi hesab edir, onları öz şəxsi nailiyyəti və ya məğlubiyyəti kimi başa düşür: birinci halda sevinir, ikinci halda kədərlənir və s. qrupun mahiyyəti ən yüksək sosial, psixoloji və pedaqoji səviyyəni o halda ala bilər ki, onun üzvləri öz istək və arzularını ümumi məqsədə yönəldə bilsin. Qrup daxilində yaranan münasibətlərin qeyd etdiyimiz səviyyəyə qalxması yalnız sosial-psixoloji assosiasiya nəticəsində mümkün olan həddə çatır. Belə hallarda fakt və hadisələr arasında yaranan əlaqələrin fərdlər tərəfindən psixoloji təhlilinə start verilir. Şəxsiyyətdə autizm hallarına əks reaksiyaların reallaşma səviyyəsi məhz ünsiyyətin aktiv sferada təzahüründə ifadə olunur.

Sosial psixoloqun fəaliyyətinin səmə-

rəsi digər tərəfdən şəxsiyyətdə verbal cəhətlərin artırılması məharətində xarakterizə olunur. Bu işin həcmi öz istinad nöqtəsini şəxsiyyətlərarası münasibətlərə qoşulma cəhətində tapır. Yəni əgər insan amilində söz ehtiyatı tələb olunan səviyyədə qazanılmayıbsa, onun ünsiyyətinin strukturunda səngimələr baş verəcəkdir. Əgər insan vizual olaraq hadisələrin başvermə səbəblərini və bu səbəblərin həlli yollarını hiss edirsə deməli çıxış yolunu həm də verbal cəhətlərində axtarıb tapmalıdır. Sosial psixoloqun proseslərə hossolunmaz dərəcədə müdaxiləsi ona görə vacibdir ki, subyektin situasiyanın təsirinə məruz qalmasının və affekt səviyyəsinə enməsinin qarşısı alınsın.

Psixologiya elmindən bizə məlumdur ki, affekt-subyekt üçün həyati əhəmiyyətli şəraitin kəskin dəyişməsi, daxili orqanların funksiyalarında dəyişiklik və kəskin hərəkət təzahürləri ilə bağlı olan güclü və nisbətən qısamüddətli hissi-emosional vəziyyətdir. Biz bu prosesin qısa şərhini yuxarıda verdiyimiz üçün digər məsələlərin təhlilinə keçirik.

Bidiyimiz kimi insan faktoru baş verən hadisələrə həmişə fəal müdaxilə etmək iqtidarında olmur. Sosial mövqe insanın subyektivliyini axıra qədər qorumaqda israrlı ola bilməz. Qarşılıqlı münasibətlər şəraitində elə hallar yarana bilir ki, situasiyalar subyektin destruktiv səviyyəyə enməsi baş verir. Destruktiv vəziyyət şəxsiyyətin strukturunda sosial-psixoloji mahiyyətin dəyişilməsi və tənəzzülü ilə nəticələnir. Sosiallaşma prosesinin arzuolunmaz həddini əks edən destruktiv səviyyə bütün hallarda qəbulolunmazdır. Çünki bu proses özünüreallaşdırma və özünütəsdiq cəhətlərinə kəskin maneələr yaradır; aqressiv davranış formaları meydana çıxır. Sosial frustrasiyanın yaranması zəruriyyətə çevrilir. Hətta belə hallarda subyektin impulsiv hərəkətlərə meyilliliyi yüksək səviyyəyə qalxır. Konflikt yarandığı üçün hadisələrin hətta cinayət səviyyəsində baş verməsi qaçılmaz həddə cərəyan edir. Qarşılıqlı münasibətlərin bu səviyyəyə enməsi sosial psixoloqun və pedaqoqların işini daha da çətinləşdirir. Müşahidələrimiz onu deməyə imkan verir ki, psixoloqlar və ya pedaqoqlar adətən sosial-psixoloji zəmində hadisələr baş verdikdən sonra hərəkətə keçirlər. Belə vəziyyətlərdə eks post fakto metodunun (hadisə baş verəndən sonra işin aparılması) imkanlarından maksimum istifadə edilsə də yaranmış problemin öhtəsindən gəlmək asan olmur. Səbəb ondan ibarətdir ki, konfliktlər çox vaxt ilk zərbədən uşaqların psixofiziologiyasında iflas yaradır; bunun da nəticəsində qarşılıqlı münasibətlərdə hərəkətlərin idarə olunmasında labillik tempini pozulur, idrak proseslərinin intensivliyi məcrasından çıxır, etiket normalarının qorunmasına yaranan motivasiya isə zəifləyərək tənəzzülə doğru irəliləyir.

Bu istiqamətdə aparılan işin mürəkkəblik səviyyəsi qeyd etdiyimiz həddə qalxdıqda mütəxəssis ilkin planda elə bir ünsiyyət modeli fikirləşməlidir ki, o, obyektin (konflikt şəraitində olan iştirakçıların) etibarını qazana bilsin. Bu prosesin fərqliliyi həm də onun uzunmüddətliyindədir. Çünki uşaqların (xüsusən münaqişəli vəziyyətdə) etibarını qazanmaq, onlarda özünə inam formalaşdırmaq işi mütəxəssisdən xüsusi səriştə və hal vəziyyətə müvafiq metodların tətbiqini tələb edir. Sosial-psixoloji işin gedişində qazanılmış etibarın səviyyəsi o həddə çatdırılmalıdır ki, şagird dostuna, tanışına, sinif yoldaşına, qardaşına, bacısına, qohumuna və hətta valideyninə açmadığı sirri sənə bəyan etsin. Düşünürük ki, bu

səviyyənin qazanılması sosial psixoloqdan və pedaqoqdan yüksək hazırlıq səviyyəsi tələb edir. Nəhayət, şagird öz daxili potensialının və yaşadığı problemlərin obyektiv arayışını təqdim etdiyi halda onun qarşılaşdığı çətinliklər aşkarlanır və beləliklə də sosial-psixoloji işin mərhələli icrası reallaşmağa doğru istiqamət götürür.

Birinci növbədə mütəxəssis şagirdin ailədaxili münasibətlər sisteminə bələd olmalı və onun sosiallaşdığı şəraitin kəmiyyət və keyfiyyət göstəricilərini qeydə almalıdır.

Sosial psixologiyada kəmiyyət göstəriciləri keyfiyyət balansının formalaşmasının mühum şərti kimi qəbul olunur. Bizim məsələyə elmi yanaşmamız da kəmiyyət göstəricilərinin prioritetliyini əsas tutur. Yəni əgər uşaq çoxuşaqlı ailə tipində sosiallaşırsa onun ünsiyyət balansı yüksək, azuşaqlı ailədə sosiallaşırsa orta, təkuşaqlı ailədə sosiallaşırsa zəif formada təşəkkül tapacaq. İndiki dövrdə cəmiyyətin məruz qaldığı ən önəmli problemlərdən biri də məhz ailələrdə uşaqların sayının az olmasıdır ki, bu problemdən irəli gələrək böyüyən nəslin sosiallaşmasında səngimələr müşahidə olunur.

Bu baxımdan mütəxəssis ilkin planda uşağın münasibətqurma bacarıqlarını təhlil etməlidir; uşaq say tərkibinə görə hansı ailəyə mənsubdur, ailədaxili münasibətlər hansı səviyyədədir, ailənin iqtisadi durumu necədir, sinifdaxili münasibətləri necə formalaşıb, məktəbdaxili münasibətlərin sosial-pedaqoji və psixoloji səciyyəsi necədir, dostları arasında nüfuzu hansı kateqoriyada (liderlik, aktivdir yoxsa passiv) yer tuta bilir; bütün bu məsələlər dəqiq parametrlər üzrə analiz olunmalı, xüsusi testlər vasitəsilə araşdırılıb üzə çıxarılmalıdır. Yalnız işin bu səviyyəsində proqnozlaşma və diaqnostika sayəsində yeni perspektivlər müəyyənləşəcəkdir ki, mütəxəssis nəzarətə götürdüyü insanı qarşılaşdığı böhran vəziyyətindən xilas edə bilər [10, s.237].

Aparılan işin ümumi gedişində ənənəvi yanaşma tərzlərindən yeni perspektivlərə doğru istiqamət müəyyənləşsə arzuolunan nəticənin alınmasına daha da yaxınlaşmış olarıq. Həmin istiqamətlərin aşağıdakı formalar üzrə aparılması yeni perspektivlər baxımından qəbulolunandır:

- yeni ünsiyyət formaları

Yeni ünsiyyət formaları insanın psixologoyasında motivasiyanın və marağın yaranmasında stimullaşdırıcı rol oynayır. Bu prosesdə yaradılan ünsiyyət mütəxəssis tərəfindən informasiyaverici olmalıdır ki, kommunikatorla (məlumatı ötürən şəxs) resipinet (məlumatı qəbul edən şəxs) arasında olan əlaqələrin verilən informasiyanın potensial imkanları vasitəsilə daha da möhkəmlənməsi reallaşsın. Mütəxəssis verdiyi informasiyanın sosial gücünü onda hiss edəcək ki, həmin informasiya şagirdlərarası əlaqələrin məzmununa təsir etsin. Qrup və ya kollektivin mövcud münasibətlərində məzmun dəyişikliyinə nail olunması sosial-psixoloji və pedaqoji işin əsas, bəlkə də ən ümdə nailiyyəti hesab etmək mümkündür. Bu işin digər tərəfdən səmərəsi ondadır ki, mütəxəssis tərəfindən ötürülən hər bir informasiya öz tənzimedici funksiyaları hesabına nəzarətdə götürülən insanı (uşaq, yeniyetmə, gənc) qrup üzvlüyündən həmin qrupun lideri səviyyəsinə qaldıra bilər. Bu nəticənin alınması mütəxəssisdən yüksək hazırlıq səviyyəsi tələb edir.

Sosial psixoloqla nəzarətə götürülən insan arasında informasiya mübadiləsini yarada biləcək vasitələrə şifahi və yazılı

nitq, mimika, ifadəli hərəkətlər, davranış aktları, təqlid və s.nin aid edilməsi həm də pedaqoji baxımdan qəbul olunandır. Burada məqbul sayılan hər bir vasitənin özünəmüvafiq təsir dərəcəsi vardır. Həmin vasitələrin sosial, pedaqoji və psixoloji imkanlarından səmərəli istifadə olunmalıdır.

- yeni münasibətlər sistemi

Yeni münasibətlər sistemi dedikdə, burada artıq qrupdaxili münasibətlərə kompleks təsiretmə mexanizmindən söhbət gedir. Bu tendensiya həm də sosial-psixoloji və pedaqoji işin ikinci mərhələsi kimi qiymətləndirilə bilər. Çünki bu mərhələdə bilavasitə qarşı tərəfin (uşaq, yeniyetmə, gənc) fəallığı nəzərdə tutulur. İşin gedişində subyekt-subyekt münasibətləri səviyyəsində formalaşan münasibətlər sistemi mütəxəssisə imkan verir ki, qarşı tərəfin iştirakçı olduğu qrupun sosial-psixoloji xarakteristikasınından mütəmadi məlumatlı olsun. Bu prosesdə qarşı tərəf özü də hiss etmədən subyekt olaraq sosial-psixoloji və pedaqoji işin fəal əməkdaşına çevrilir. Yəni bu mərhələdə mütəxəssis tək qalmır; qəribə səslənsə də onun köməkçisi tapılır.

Sosial-psixoloji və pedaqoji işi digər fəaliyyət növlərindən fərqləndirən cəhət məhz bu prosesdə insan amilinin öz potensialından maksimum istifadə olunmasındadır. Bu baxımdan mütəxəssis insanlarla qarşılıqlı münasibətlər şəraitində qrupun mövcud münasibətləri barədə obyektiv məlumatlar əldə edir. Deməli, artıq qrup üzvünün öz potensialından istifadə etməklə sosial-psixoloji və pedaqoji iş genişlənib qrupda mövcud münasibətlər sisteminin kompleksini əhatə edə bilir. Mütəxəssis belə vəziyyətlərdə artıq ümumi münasibətlər şəbəkəsini yaratmağa nail olur. Görülən işin səmərəsi məqsədə nə dərəcədə irəliləmə tempinə müvafiq qiymətləndirilir. Əldə olunan nəticələr sosial-psixoloqun və ya pedaqoqun praktik iş bacarığının qiymətləndirilməsində mühüm meyarlar kimi qəbul olunur.

- yeni yanaşma modeli

Yeni yanaşma modelinin reallaşması bir neçə prinsiplə xarakterizə olunur. Bu prinsiplərin mərkəzində insan şəxsiyyətinə hörmət və ehtiram bəsləməklə onun sosial mövqeyini yüksək səviyyədə qiymətləndirilməsi tendensiyası durur. Aparılan işin bu istiqamətdə qurulması həm şagirdin daxili psixi vəziyyətini, həm də onun sosial imkanlarını üzə çıxardır. Şagird psixologiyasının daxili laylarında ünsiyyət elementlərinin təzahürü sosial-psixoloji və pedaqoji nöqteyi-nəzərdən qəbulolunandır. Çünki yalnız təkmilləşmiş sosial-psixoloji normalardan əmələ gələn yeni yanaşma modelinin tətbiqi şəraitində insan psixologiyasının sosial törəmələri əmələ gələ bilir. Sosial-psixoloji və pedaqoji işin mərkəzi nüvəsini qabaqcadan hazırlanmış perspektivli iş planı təşkil edir. Fəaliyyətin bu növü qeyd etdiyimiz səviyyədə qəbul olunan həddə qalxa bilir. Buna görə də, istər məktəbdə, istər ailədə, istərsə də asudə vaxt ərzində (ailədən və məktəbdən kənar mühitdə) insan şəxsiyyətinin sosiallaşmasını şərtləndirən bütün imkanlardan kompleks istifadə olunmalıdır. Çünki bizim məqsədimiz yetişən nəslin hərtərəfli və ahəngdar inkişafını təmin etməkdən ibarətdir. Qarşımızda duran ən mühüm vəzifə odur ki, biz hərtərəfli inkişaf etmiş, bilik, bacarıq və vərdişləri mükəmməl qavrayan, qazandığı keyfiyyətləri vətənin, xalqının və dövlətinin inkişafına istiqamətləndirməyi bacaran və ən nəhayət cəmiyyətin tələb olunan normaları daxilində ictimai münasibətlər sisteminə intiqrasiyaya

nail olmaqla ölkəsini dünya dövlətləri sırasında layiqincə təmsil etməyi daxili potensialında hiss edən, rəqabətədavamlı vətəndaşları yetişdirək. Məhz bu vəzifəsinin reallaşması əsasdır.

***Rəyçi: prof. Ə.Ağayev***

## İstifadə edilmiş ədəbiyyat


1. Ağayev Ə., Rzayeva Y. və b. Sosial pedaqogika. Bakı, 2008.
2. Ağayev Ə. Təlim prosesi: ənənə və müasirlik. Bakı, 2006.
3. Abdulov R. Məktəbdə sosial pedaqoji işin əsasları. Bakı, 2005.
4. Qəhrəmanov A. Ümumi orta təhsil səviyyəsinin yeni fənn kurikulumlarının tətbiqi üzrə təlim kursunun iştirakçıları üçün. Təlim materialı. Bakı, 2012.
5. Əlizadə Ə., Bayramov Ə. Sosial psixologiya. Bakı, 2003.
6. Əlizadə Ə. Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. Bakı, 2004.
7. Əlizadə H. Sosial pedaqogikanın aktual məsələləri. Bakı,1998.
8. Əlizadə H., Mahmudova R. Sosial pedaqogika. Bakı, 2013.
9. Əliyev B., Əliyeva K., Cabbarov R. Pedaqoji Psixologiya. Bakı, 2014.
10. Mehrabov A. Müasir təhsilin konseptual problemləri. Bakı, 2010.
11. Мудрик А. Социалная педагогика. Москва, 2002.


**С.Джафаров**

**Психологические и педагогические параметры социализаций человека**

**Резюме**


В статье рассматриваются вопросы оценивания социально-психологических факторов в системе управление педагогического процесса.

В статье, в основном, отражено формирование работы учеников в условии общественного отношения, и, требование стоящих перед школьном директором, в успешном проведении этой работы. В статье также обсуждены и предложены пути использования потенциала учеников в структуре управления педагогического процесса.


**S.Jafarov**

**Psychological and pedagogical parametres of socialization of a human**

**Summary**


The article deals with the taking into consideration the social, psychological and pedagogical points in the management system of pedagogical process. The formation work of a pupil mainly in the situation of social relations and the duties of school principles in carrying this work are reflected in the article. The usage ways of a pupil`s potentials in formation of managament structure of pedagogical process have been analysed and presented too.



# PEDAQOJİ QİYMƏTLƏNDİRMƏ PEDAQOJİ TEXNOLOGİYALARDAN BİRİ KİMİ

**Sevda Heydərova,**
***Bakı şəhəri, 20 nömrəli tam orta məktəbin müəllimi***

Məqalədə təhsil sahəsində əldə olunmuş nailiyyətlərdən və müasir təlim texnalogiyalarından danışılır. Pedaqoji qiymətləndirmənin bu texnologiyalardan biri olması göstərilir. Ümumtəhsil məktəblərində təhsilin keyfiyyətini yüksəltmək məqsədi ilə şagird nailiyyətinin qiymətləndirilməsində səmərəli üsul və vasiələrin əhəmiyyətindən bəhs olunur. İnformasiya kommunikasiya texnalogiyalarının (İKT) məqsədəuyğun şəkildə istifadəsinin şagirdlərin bilik və bacarıqlarının formalaşmasındakı rolu açıqlanır.

***Açar sözlər:*** *pedaqoji texnologiyalar, qiymətləndirmə texnologiyaları, texnologiyaların əhəmiyyəti, qiymətləndirmə konsepsiyası.*

***Ключевые слова:*** *педагогические технологии, технология оценивания, важность технологий,концепция оценивания.*

***Key words:*** *educational technologies, technology of assessment, importance of technologies, conception of education.*

Cəmiyyətdə baş verən dəyişiklik zaman-zaman insan övladının təlim və tərbiyəsinin formalaşmasına xidmət edib. Müstəqillik qazanmış Azərbaycan Respublikasında gedən sürətli inkişaf təhsil sistemində də öz əksini tapıb. Qlobal dünyanın təhsil sisteminə inteqrasiya təhsildə yeni texnologiyaların öyrənilməsinə, tədris prosesində tətbiq edilməsinə zərurət yaradıb. Azərbaycan Respublikasında təhsil müəssələrində qərb dövlətlərinin təhsil sistemində istifadə edilən səmərəli metodlarından məqsədəuyğun şəkildə istifadə edilir. Şagirdlərin şəxsiyyət kimi formalaşdırılmasında bu metodların xüsusi yeri vardır. Demokratik fikirli şagird şəxsiyyətini formalaşdırmaq üçün təlimin humanistləşdirilməsi prinsipi sosial, bəşəri və mədəni ideyalara xidmət etməlidir. Bildiyimiz kimi islahatın əsas mahiyyətini təhsilin humanistləşdirilməsi, humanitarlaşdırılması, demokratikləşdirilməsi, diferensiallaşdırılması və inteqrasiya kimi prinsiplər təşkil edir. Bəşəri dəyərlərə, milli mənəvi ideyalara əsaslanan bu prinsiplər təhsil alanın şəxsiyyət kimi formalaşdırılmasında onun subyekt olaraq yetişməsi məsələsini qarşıya qoyur. Müasir təlim texnologiyalarına əsasən şagirdlərdə məntiqi təfəkkürün sürətli inkişafı, intellektual səviyyə, mənəvi cəhətdən sağlam

bilikli, bacarıqlı, şagirdlərin yetişdirilməsi əsas məsələlərdən biridir. Şagirdlərin öz fikirlərini sərbəst, aydın şəkildə ifadə etmələrində səmərəli təlim texnologiyalarının əhəmiyyəti çoxdur. Bu metodlar şagirdlərdə qarşılıqlı əməkdaşlıq, birgə ünsiyyət qurma kimi halları formalaşdırır [1].

Ölkədə insan kapitalının inkişafının əsas götrüldüyü bir dövrdə qabaqcıl texoalogiyalardan, idarə etmə üsullarından məqsədə uyğun şəkildə istifadə etməklə müasir zamanın elmi nailiyyətləri əsasında şəxsiyyətin yetişdirilməsi Azərbaycan Respublikasının təhsilin inkişafı üzrə Dövlət Strategiyasında öz önəmli yerini tutmuşdur. Fasiləsiz təhsil konteksində şəxsiyyətin, kamil insanın hazırlığı üzrə dünya təcrübəsinə inteqrasiya prinsipi zəruri faktor kimi qəbul edilməli, həmin istiqamətdə konkret fəaliyyət həyata keçirilməlidi. Yeni təlim texnologiyalarından istifa-də bütövlükdə ənənəvi təlim metodlarından tamamilə imtina etmək deyil. Müasir təlim texnologiyaları ilə qarşılıqlı olaraq elmi əsasları olan ənənəvi təlim metodlarından da səmərəli şəkildə istifadə olunur. Bu gün qlobal dünyanın təhsil sisteminə cavab verən şəxiyyətyönümlü, inkişafyönümlü, interaktiv, fəal təlimin yaradılmasında müasir tələblərə cavab verən texnologiyaların köməyi əsas faktorlardan biridir.

Müstəqilliyimizin ilk illərində təhsil sahəsində aparılan eksperimentlərin, tətbiq olunan yeniliklərin səmərəliliyinin artırılması, nəticələrin izlənilməsi, proqnozlaşdırılması və korreksiya işlərinin vaxtında həyata keçirilməsi məqsədi ilə təhsildə monitorinq və qiymətləndirmə mexanizmi tətbiq olunmağa başlanmışdır. Hazırda nəinki ölkəmizdə, hətta dünyanın inkişaf etmiş bir sıra digər ölkələrində də təhsildə monitorinq və qiymətləndirmə sistemi kifayət qədər mükəmməl qurulmayıb və əksər hallarda bu, lokal xarakter daşıyır. Azərbaycan Respublikası Nazirlər Kabinetinin 13 yanvar 2009-cu il tarixli qərarı ilə "Azərbaycan Respublikasının ümumi təhsil sistemində Qiymətləndirmə Konsepsiyası" təsdiq olunmuşdur. Sənəddə müasir dövrdə şagird nailiyyətlərinin qiymətləndirilməsi sisteminin vəzifələri, əsas xüsusiyyətləri, bu sahədə mövcud olan problemlər Konsepsiyanın yaradılması üçün zəruri səbəblər, əsas qiymətləndirmə növləri, qiymətləndirmə standartlarının və vasitələrinin hazırlanması və sair məsələlər əks olunmuşdur. Konsepsiyada təlim-tərbiyə işlərini müasir dövrün tələblərinə müvafiq qurmaq məqsədilə qiymətləndirmə fəaliyyətinin aşağıdakı tələbləri təmin etməsi qeyd edilir:

- təhsildə müsbət dəyişikliklərin aparılması üçün mühüm vasitə rolunun yerinə yetirilməsi; təhsilin keyfiyyəti üçün əsas göstərici olan şagirdin təlim nəticələri haqqında etibarlı məlumatın verilməsi;
- qiymətləndirmə vasitəsilə şagirdin bilik və bacarıqları haqqında kifayət qədər məlumat əldə edildikdən sonra fənn kurikulumlarında və dərsliklərdə müvafiq dəyişikliklərin aparılması;
- təhsildə olan bəzi neqativ hallara qarşı mübarizə vasitəsi funksiyası;
- qiymətləndirmədə yeni yanaşmaların yaddaşa əsaslanan qiymətləndirmənin əksinə olaraq, məntiqi təfəkkür vərdişlərinin inkişafına xidmət etməsi.

Sənəddə qiymətləndirmə fəaliyyətinə qoyulan tələblərin əməli vəzifəsi, hər şeydən əvvəl, məktəblərimizdə təlim-tərbiyə işlərinin məzmun, forma, vasitə və metodlarını

təkmilləşdirmək yolu ilə təhsilin keyfiyyətini əsaslı surətdə yaxşılaşdırmaqdan, müəllimlərin yaradıcılığını artırmaqdan və məktəb işlərinin keyfiyyətini bütünlüklə müasir dövrün tələbləri səviyyəsinə qaldırmaqdan ibarətdir.

Qeyd etmək istərdik ki, respublikamızın ümumtəhsil sistemində monitorinq və qiymətləndirmə həmişə mövcud olmuşdur. Buraya şagirdlərin bilik səviyyələrini dəqiqləşdirmək üçün aparılan yoxlama işləri, imtahanlar və inspektor yoxlamaları aiddir. Lakin təcrübə göstərir ki, bütün bu ənənəvi yoxlama (monitorinq) formaları lazımi effekt vermir və onların bir sıra çatışmazlıqları meydana çıxır [2]:

- birinci, tədrisin vəziyyətinə nəzarət mütəmadi deyil, epizodik xarakter daşıyır və buna görə də tədris prosesindəki dəyişikliklərin dinamikasını müşahidə etmək mümkün olmur;

- ikinci, əsasən, tədris prosesinin nəticəsi öyrənilir. Bu halda tədris prosesinin özü, yəni bilik, bacarıq və vərdişlərin formalaşdırılması yoxlayıcıların diqqətindən kənarda qalır;

- üçüncü, bü növ yoxlamaların nəticələri yetərincə şəffaf aparılmır, nəticələr təhlil olunduqda balla qiymətləndirmədən istifadə edilir, bu isə şagirdlər tərəfindən tədris kursunun mənimsənilməsi səviyyəsini araşdırmağa imkan vermir.

Göstərilən çatışmazlıqlar əsas problemləri - şagirdlərin biliklərindəki bu və ya digər boşluqların səbəblərini, müəllimlərin işində olan çatışmazlıqları, şagirdlərin təlim-tərbiyə prosesinə təsir edən mənfi amilləri müəyyənləşdirməyə imkan vermədiyindən mahiyyət etibarilə idarəetmədə dəqiq diaqnoz qoymaq mümkün olmur. Bu halda təhsil prosesinin özü, onun yekunlarını müəyyənləşdirən bilik və bacarıqların formalaşması diqqətdən kənarda qalır. Nəticələrin yoxlanılması və təhlili zamanı istifadə olunan qeyri-dəqiq məlumatlar, subyektiv qiymət balları və yoxlama, tapşırıqlara verilən qiymətlər bütövlükdə şagirdlərin təlim materiallarının məzmununu nə dərəcədə qavrayıb-qavramadığını aydınlaşdırmağa imkan vermir. Buna görə də təlim-tərbiyə prosesinin nəticələrinin ardıcıl öyrənilməsi sisteminin yaradılması və onun işləməsinin qaydaya salınması ümumtəhsil məktəblərinin idarəetmə fəaliyyətində mühüm məsələyə çevrilir.

Aparılmış araşdırmalar zamanı müəyyən edilmişdir ki, ümumtəhsil məktəblərində sistemli, məqsədyönlü, elmi-pedaqoji cəhətdən əsaslandırılmış qiymətləndirmə sistemindən istifadə təmin edilmədiyindən məktəbdə təlim - tərbiyə prosesinin keyfiyyət göstəriciləri getdikcə aşağı düşmüşdür. Bu baxımdan ümumtəhsil məktəblərində keyfiyyətin daha dəqiq, obyektiv ölçülməsi, bütövlükdə müəssisənin fəaliyyətinin monitorinqi və qiymətləndirilməsi üçün elmi cəhətdən əsaslandırılmış yeni, etibarlı bir mexanizmin yaradılması zərurətə çevrilmişdir.

Monitorinq və qiymətləndirmə ümumtəhsil məktəblərində təhsilin keyfiyyətinin müəyyənləşdirilməsi üçün vacib sayılan amillərdən biridir. Apardığımız müşahidələr zamanı müəyyən olunmuşdur ki, hazırda ümumtəhsil məktəblərində təhsilin keyfiyyətinin müəyyənləşdirilməsi üçün mövcud qiymətləndirmə sistemində aşağıdakı problemlər mövcuddur:

- şagirdlərin təlim nailiyyətlərinin qiymətləndirilməsində obyektivliyin, şəf-

faflığın və müstəqilliyin təmin olunmaması;

- şagirdlərin təlim nailiyyətlərinin qiymətləndirilməsində biliyin keyfiyyətini qiymətləndirmə meyarlarının olmaması;

- təlim prosesində şagirdlərdə formalaşdırılacaq keyfiyyətlərin (ümuminsani, milli-mənəvi və s.) məzmununun olmaması;

- didaktik sistemlərin, pedaqoji texnologiyaların keyfiyyətinin qiymətləndirmə meyarlarının olmaması;

- müəllimin tədrisə hazırlığının keyfiyyətinin müəyyənləşdirilməsi üçün meyarlar sisteminin olmaması;

- müəllimin tədris nailiyyətlərinin qiymətləndirilməsi üçün meyarların olmaması;

- məktəb rəhbərlərinin mövcud nöqsanları aradan qaldırması üçün təlim-tərbiyə prosesinin keyfiyyətinin yüksəlməsinə yönələn təlim nəticələrinin müntəzəm qiymətləndirilməsi sisteminin olmaması;

- məktəbin tədris fəaliyyətinin qiymətləndirilməsinin vaxtaşırı iştirakçılarının fəaliyyətinin məqsədəmüvafiqliyi üçün məlumatların toplanması prosesidir. Bu zaman ekspertlərin monitorinqinin aparılması üçün meyarların olmaması.

Müasir anlamda ümumtəhsil məktəblərində monitorinq və qiymətləndirmənin başlıca məqsədi təhsil müəssisəsi rəhbərlərinə, müəllimlərə, həm də şagirdlərə məktəbdə təlim-tərbiyə prosesinin vəziyyəti haqqında obyektiv məlumat vermək və təhsilin keyfiyyətini daha da yüksəltmək imkanı yaratmaqdır.

Ümumtəhsil məktəblərində pedaqoji prosesin səmərəliliyini və inkişafını müəyyənləşdirmək, ilk növbədə, pedaqoji prosesin əsas qiymətləndirməni aşağıdakı prinsiplərə əsasən aparması məktəbin təlim-tərbiyə prosesinin keyfiyyəti haqqında tam, müfəssəl təsəvvür əldə etməyə şərait yaradar:

- qiymətləndiriləcək obyekt (pedaqoji proses və yaxud onun hər hansı elementi) barədə

hazırlanması dəqiq və etibarlı informasiyaların toplanması;

- monitorinq nəticəsində əldə olunmuş materiallar təhlil olunduqdan sonra təhsilin keyfiyyətini qiymətləndirərkən kəmiyyət ölçmələrindən istifadənin dəqiq aparılması;

- bunun üçün əvvəlcədən xüsusi normativ-hüquqi sənədlərin;

- monitorinq müşahidələri ilə qiymətləndirmə zamanı şəffaflığın təmin olunması məqsədilə nəticələr barədə, həm də qiymətləndirmənin yerinə yetirilməsi haqqında ictimaiyyətin və rəsmi orqanların mütəmadi məlumatlandırılması;

- təhsilin keyfiyyətinin qiymətləndirilməsinin beynəlxalq standartlara uyğun aparılması.

Azərbaycan Respublikası inkişaf etmiş ölkələr sırasında öz önəmli yerini tutmaqda davam edir. Cəmiyyətdə baş verən sürətli inkişaf ölkənin bütün sahələrində olduğu kimi təhsil sahəsində də öz əksini tapır. Təhsil alanların bilikli, bacarıqlı şəxsiyyət kimi formalaşmasında insan resurslarının inkişafı əhəmiyyətlidir. Müstəqillik qazanmış Azərbaycan Respublikasında təhsil sahəsində cəmiyyətin tələbinə uyğun olaraq bir çox uğurlar əldə olunmuşdur. Təhsildə İnkişaf Lahiyəsinə uyğun olaraq ənənəvi sistemdən Milli Kurikuluma keçid təhsildə keyfiyyətinin yüksəldilməsinə kömək etdi. Ümumi təhsil müəssisələrində informasiya kommunikasiya texlnologiyalarından (İKT) istifadə, elektron

tədris resuslarının yaradılması təhsilin keyfiyyətini artıran amillərə çevrildi. İnformatika fənninin bütün siniflərdə tədrisi, müəllimlərin müxtəlif təlim kurslarından keçməsi informatika haqqında bilik və bacarıqların genişlənməsinə, möhkəmlənməsinə zəmin yaratdı. İKT –nin süətli inkişafı yeni təhsil modellərinin yaradılmasına səbəb oldu. Distant təhsil belə modellərdən biridir ki, hətta xüsusi qayğıya ehtiyacı olan şagirdlər təhsilə cəlb olunmağa başladılar. Xüsusi proqramla dövlət lahiyəsi çərçivəsində evdə təhsilə cəlb olundular. Onlara təhsil nazirliyinin müəyyən etdiyi proqramlar əsasında dərslər keçirilməyə başlanıldı. Distant təhsil bu gündə öz fəaliyyətini davam etdirir. Bu isə onların cəmiyyət üçün gərəkli olmalarına əsaslı sübutdur. İnteraktiv təlim metodlarından, formalarından səmərəli istifadə təhsil sahəsinə bir çox yeniliklər gətirdi. Bu isə öz növbəsində istedadlı uşaqların müəyyən olmasına, onların inkişaf etdirilməsinə kömək etdi. Belə şagirdlərin fitri istedları sayəsində əldə etdiyi ixtiralar ölkədə gedən "Təhsil Sərgiləri"ndə nümayiş etdirildi. Ən yaxşıları dəyərləndirildi, öz layiqli yerini tutdu. Təhsil sistemindəki bu uğurlar inkişaf etmiş ölkələrin alimlərinin diqqətini özünə cəlb etdi [3]. Belə ixtiralardan biri A.Hüseynzadə adına 20 saylı tam orta məktəb liseyin sagirdinin nail olduğu uğurdur. Bu ideya şadirdimizin kəşf etdiyi mobil telefon vasitəsi ilə kompüterin idarə olunmasıdır. Bu gün də ölkəmizdə istedadlı şagirdlərin inkişafı ilə bağlı işlər sürətlə davam edir. Tədris prosesində təlim texnologiyalarından səmərəli və məqsədyönlü istifadə cəmiyyətin kamil, rəqabətəqabil, bilikli, bacarıqlı, məntiqi təfəkkürü inkişaf etdirilərək formalaşan insan yetişməsinə kömək edir.

Təhsil sahəsində keyfiyyətə nail olmaq üçün pedaqoji və psixoloji texnologiyalar sırasında qiymətləndirmə texnologiyalarının da əhəmiyyəti böyükdür. Ənənəvi təhsil sitemindən Milli Kurikuluma keçid dövründə orta ümumtəhsil məktəblərində bir çox dəyişikliklərlə bərabər qiymətləndirmə sahəsində də yeni texnologiyaların yaranması məsələsi gündəmə gəldi.

Dünyada gedən qloballaşma həyatın bir çox sahələrinə öz təsirini göstərir. Təhsildə aparılan islahat məhz həmin zərurətdən yaranmışdır. Təhsilin keyfiyyətini yüksəltmək, yeni pedaqoji texnologiyaları öyrənib onlardan səmərəli istifadə etmək başlıca vəzifə kimi qarşıda durur. Müəllimin ümumi proqramı və dərsə hazırlığı yüksək səviyyədə olmalıdır.

Məlum həqiqətdir ki, hər dövrün özünəməxsus pedaqoji fikri vardır. İndi təlim-tərbiyə prosesində şəxsiyyət anlamı daha demokratik şəkildə dərk edilir. Şagirdin subyekt olması müasir dövrün çox səslənən və bəzən mübahisələrə səbəb olan məsələlərindəndir.

Yeni pedaqoji təfəkkürün başlıca prinsipləri-demokratikləşmə, humanistləşdirmə, fərdiləşdirmə, diferensiallaşdırma, inteqrasiya, şəxsiyyətin formalaşdırılması və inkişaf etdirilməsini həyata keçirir. Yeni pedaqoji texnologiya fəal təlimə əsaslanır. Fəal təlimin modeli müəyyən olunan komponentlərlə şərtlənir. Bura fəal təlimin məzmunu, metodları, öyrədici mühit, qiymətləndirmə daxildir.

Təlimin məzmunu nəyi öyrətmək, necə öyrətmək, hansı şəraitdə öyrətmək prinsiplərinə əsaslanır Qiymətləndirmə ayrı-ayrı

komponentlərin səmərəliliyini müəyyən edən amillərə uyğun olaraq nəticəni aşkarlayır.

Fəal təlim prosesində şagirdlər tam hüquqlu iştirakçı olmaqla, qazanılan bilikləri axtarışlar və kəşflər hesabına mənimsəyirlər.

Fəal təlim metodları bir sıra xüsusiyyətləri ilə seçilir:

1. Şagirdlərin fəal öyrənmə mövqeyi.
2. Təfəkkürün müstəqilliyi və sərbəstliyi.
3. Əməkdaşlıq və qrupda qarşılıqlı fəaliyyət.
4. Həyati məqsədlərə nail olmaq üçün biliklərin yaradıcı tətbiqi.

Qeyd olunan xüsusiyyətlər şagirdlərin təlim əməyi üzrə hazırlığının başlıca amilləridir.

Fəal təlim zamanı müəllim şagirdlərə fərdi yanaşmalı, onların bilik, bacarıq və vərdişlərinin inkişafı üçün daha səmərəli tədris üsullarından, informasiya texnologiyalarından istifadə etməlidir.

Son illər respublikamızda interaktiv təlim metodlarının mənimsənilərək iş prosesinə tətbiqi sahəsində müəyyən nəticələr əldə olunmuşdur. Tədris prosesində fəal-interaktiv təlim texnologiyalarının tətbiqi dərslərin səmərəliliyini yüksəldən ən vacib şərtlərdəndir.

Tədris zamanı dərslərdə qruplarla iş, fərdi iş, Venn diaqramları, şaxələnmə, məntiqi çalışmalar və b. üsullardan istifadə şagirdlərin mənimsəmə qabiliyyətini, idrak fəallığını artırır. Ona görə də mən dərslərimdə bu üsullardan geniş istifadə edirəm.

Təhsil sahəsində qiymətləndirmə qarşılıqlı münasibətdə olan şəxslərin qiymətləndirilməsidir. Məhz qiymətləndirmə sayəsində təhsilin keyfiyyətin səmərəliliyini müəyyən etmək mümkündür. Bunun üçün qiymətləndirməni zəruri edən amillərdən məqsədəuyğun şəkildə istifadə etmək lazımdır.

Milli kurikuluma əsasən qiymətləndirməni zəruri edən şərtlər bunlardır:

1. Təhsil fəaliyyətinin səmərəlilik səviyyəsinin müəyyən edilməsi.
2. Təhsil standartlarının tələbata uyğunluğunun monitorinqinin həyata keçirilməsi.
3. Ölkə üzrə şagirdlərin nailiyyətləri barədə obyektiv məlumatların əldə edilməsi.
4. Təlim prosesinin təkmilləşdirilməsi.

Bu amillər təhsil sahəsində qazanılan uğurların müəyyən edilməsi, təhsil alanların bilik, bacarıq və vərdişlərini müəyyən edəcək monitorinqlərin keçirilməsinə zəmin yaradır. Bu isə öz növbəsində cəmiyyətin tələbinə cavab verən şəxsiyyətlərin yetişməsinə xidmət edir.

Təhsil sahəsində nailiyyətlərin ölçülməsi ölkəmizdə 3 istiqamətdə aparılır.

1. Beynəlxalq qiymətləndirmə
2. Milli qiymətləndirmə
3. Məktəbdaxili qiymətləndirmə

Beynəlxalq qiymətləndirmə, təhsil sahəsində inkişafın qlobal dünyanın təhsil sahəsində uyğunluğu əsasında müəyyənləşdirilir.

Milli qiymətləndirmə ölkə daxılində təhsilsin keyfiyyətini müəyyənləşdirir.

Məktəbdaxili qiymətləndirmə standartlarada göstərilən nəticələrə əsasən şagirdlərin sinifdən sinfə, bir təhsil pilləsindən digər təhsil pilləsinə keçməsinə

zəmin yaradır. Məkdəbdaxili qiymətləndirmə üç istiqamətdə aparılır.

1. Diaqnostik qiymətləndirmə
2. Formativ qiymətləndirmə
3. Summativ (yekun) qiymətləndirmə

Diaqnostik qiymətləndirmə tədris ilinin və tədris vahidlərinin əvvəlində müxtəlif üsul və vasitələrin köməyi ilə aparılır. Hətta şagird bir məktəbdən başqa məktəbə, bir sinifdən başqa sinfə keçiriləndə də aparıla bilər. Diaqnostik qiymətləndirmənin nəticələri rəsmi sənədlərdə qeyd olunmur. Müəllimin qeyd kitabçasında qeyd olunur, şagird üçün nəzərdə tutulan portfolida saxlanılır.

Formativ qiymətləndirmə şagirdlərin inkişaf dinamikasını izləmək məqsədi ilə davamlı aparılır. Bu qeydlər sinif jurnalında deyil müəllimin xüsusi qeydləri olan jurnalda yazılır. Formativ qiymətləndirmə vasıtəsi ilə fənn üzrə verilmiş standartlar əsasında şagirdlərin əldə etdiyi nailiyyətlər izlənilir. Bəhs və bölmələrin mənimsənilməsində geriləyən şagirdlərlə fərdi işlər aparılır. Formativ qiymətləndirmə (monitorinqlər) müxtəlif vasitə və üsullardan istifadə etməklə aparıla bilər. Bu monitorinqlər tədris ili ərzində davamlı aparılır, şagird portfolisində öz əksini tapır.

Summativ qiymətləndirmə üç mərhələdə aparılır. Kiçik summativ qiymətləndirmə (KSQ), böyük summativ qiymətləndirmə (BSQ) və yekun summativ qiymətləndirmə (Y). Məzmun standartlarının tələblərinə cavab verən KSQ və BSQ tədris ili ərzində müxtəlif üsullardan, vasitələrdən istifadə etməklə (bəhs və bölmələrin sonunda) şagird nailiyyətlərini dəyərləndirmək məqsədi ilə aparılır. KSQ altı həftədən gec olmayaraq, BSQ yarım illərin sonunda aparılır. Burada əsas məqsəd qazanılan biliklərin mənimsəmə və tətbiq etmə səviyyəsini öyrənməkdir. Bu qiymətləndirmə keçirildiyi tarixdə sinif jurnalında yazılmalıdır.

Böyük summativ qiymətləndirmə (BSQ) birinci və ikinci yarım illərin sonunda təhsil müəssisəsinin rəhbərliyi və ya məktəb tərəfindən təşkil olunmuş komissiyanın nəzarəti ilə sinif rəhbəri tərəfindən aparılır. Tədris ilinin sonunda illik yekun (Y) qiymətləndirmə yarımillərin nəticələrini toplayaraq ikiyə bölməklə hesablanır. Ənənəvi təlim sistemi tətbiq olunan siniflərdə qiymətləndirmə əvvəlki qaydada aparılır [4].

Ümumtəhsil məktəblərində tədris ilinin sonunda buraxılış siniflərində şagird nailiy-yətlərinin dəyərləndirilməsi mərkəzləşmiş attestasiya şəklində aparılır.

Ölkəmizdə təhsil sahəsində tətbiq olunan müasir təlim texnologiyaları sırasında qiymətləndirmə texnologiyalarının keyfiyyətinin əhəmiyyəti böyükdür. Qiymətləndirmənin daha səmərəli və dəqiq olması ilə bağlı qiymətləndirmə standartları üzərində fikirlər bu gün də inkişaf etdirilir. Artıq bu prosesi yerinə yetirmək üçün lazım olan forma, üsul, vasitələlər müəyyənləşdirilib. Pedaqoji qiymətləndirmə ümumi təhsil məktəblərində çalışan və təhsil alan hər bir kəsin əməyinin dəyərləndirilməsidir. Bu mərhələnin konkret və mükəmməl yaradılması təhsil sahəsində əldə olunan ən böyük nailiyyətlərdən biridir.

Təhsildə İnkişaf Lahiyəsinə uyğun olaraq respublikamızda həyata keçirilən islahatlar proqramı əsasında işlər bu gündə

davam edir. Normativ hüquqi bazaya əsaslanaraq aparılan qiymətləndirmə mərhələsi təhsil texnologiyalarının tərkib hissəsi olaraq təhsilin keyfiyyətini yüksəldən amillərdən biri kimi dəqiq və səmərəli şəkildə bu gün də ümumtəhsil məktəblərində müəllimlər və məktəb rəhbərliyi tərəfindən həyata keçirilir [5].

Elmi yenilik. Təhsil sahəsində qiymətləndirmə qarşılıqlı münasibətdə olan şəxslərin qiymətləndirilməsidir. Məhz qiymətləndirmə sayəsində təhsil sahəsində keyfiyyətin səmərəliliyini müəyyən etmək mümkündür. Bunun üçün qiymətləndirməni zəruri edən amillərdən məqsədəuyğun şəkildə istifadə etmək lazımdır.

Praktik əhəmiyyəti: Pedaqoji texnologiyalardan tədris prosesində səmərəli istifadə təhsilin keyfiyyətini yüksəldən amillərdən biridir.

Aktuallığı: Pedaqoji qiymətləndirmə ümumi təhsil məktəblərində təhsil alan hər bir kəsin əldə etdiyi nailiyyətlərin dəyərləndirilməsidir.

***Rəyçi: dos. İ.Cavadov***

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. //Azərbaycan məktəbi, 2013, №5.

2. Cabbarlı M. Təhsil dövlət siyasətinin prioritetləri sırasında ilk yerlərdən birini tutur. “Azərbaycan” qəzeti, 2015, 1 mart.

3. Məkdəbdaxili qiymətləndirmə: tədqiqatlar və nəticələr. Bakı, 2016.

4. Nəzərov A. Müasir təlim texnologiyaları. Bakı, 2012

5. Azərbaycan Respublikasının ümumi təhsil sistemində Qiymətləndirmə Konsepsiyası. //Kurikulum, 2009, № 4.

**С.Гейдарова**

**Педагогическое оценивание как одна из педагогических технологий**

**Резюме**

В статье говорится о достижениях в области образования и современных образовательных технологий. Учебные технологии обозначаются как одна из этих технологий. Говоря о важности эффективных методов повышения качества образования в средних школах и в оценке успеваемости учащихся. Также определяется роль информационных и коммуникационных технологий (ИКТ) в соответствии с целевым назначением для формирования знаний и умений студентов.

**S.Heydarova**

**Educational assessment as an educational technology**

**Summary**

The article dedicated to the quality of education and its management problems. In articleanalyzed different problems , for their effective solving suggestions and recommendations are also given. Also speaks about the need of specification of assessment, improvement of material and technical, organizational, legal, human resources and information databases corresponding reforms to the education system.





# ƏQLİ MÜLKİYYƏT MƏDƏNİYYƏTİNİN FORMALAŞDIRILMASI MƏSƏLƏLƏRİ

**İntiqam Cəbrayılov,**
***ARTİ, təhsil nəzəriyyəsi şöbəsinin müdiri, pedaqogika üzrə elmlər doktoru, professor***

**Könül Mikayılova,**
***həmin şöbənin böyük elmi işçisi***

***Açar sözlər:*** *tələbə, elm, mədəniyyət, qanun, əql, mülkiyyət, pedaqoji aspektlər.*
***Ключевые слова:*** *студент, наука, культура, право, интеллект, собственность, педагогические аспекты.*
***Key words:*** *student, science, culture, law, intellect, property, pedagogical aspects.*

Təcrübə və araşdırmalar göstərir ki, cəmiyyətin inkişafında şəxsiyyət amili, şəxsiyyətin formalaşdırılması problemi son dərəcə mühüm əhəmiyyət kəsb edir. Bu baxımdan yüksək mənəvi keyfiyyətlərə malik, mədəni, elmi dünyagörüşü ilə fərqlənən şəxsiyyətlərin yetişdirilməsi ən vacib məsələlərdən biridir. Bu gün ali təhsil müəssisələrində elmi biliklərlə yanaşı mədəni-mənəvi keyfiyyətlərə malik şəxsiyyətlərin formalaşdırılmasına da son dərəcə ciddi yanaşılmalı və təlim-tərbiyə işinin keyfiyyət göstəriciləri daha da yüksəldilməlidir.

Ulu Öndər Heydər Əliyev qeyd etmişdir: "Gənclərimizi elmə, mədəniyyətə daha çox cəlb etmək lazımdır. Gənclərimizdə elmi-tədqiqat işlərinə həvəs oyatmaq lazımdır. Ümidvaram ki, bizim bugünkü gənclərimiz keçmiş dövrlərdə olan gənclərdən daha da yüksək təhsil ala biləcəklər və gələcək üçün daha da bilikli, daha da yüksək səviyyəli olacaqlar" [12].

Ümumiyyətlə, müxtəlif tarixi dövrlərdə yaşamış digər mütəfəkkirlərin fikirləri də təsdiq edir ki, insanın şəxsiyyət kimi formalaşmasında mədəniyyət amili böyük rol oynayır. Böyük filosof Nəsirəddin Tusi elmlə mədəniyyətin vəhdəti prinsipini irəli sürmüşdür. O hesab edir ki, elmlə mədəniyyət bir istiqamətə, humanizmə xidmət etməlidir. Elmlə mədəniyyətin vəhdətini yaratmaq bəşər övladının borcudur [14]. Müasir dövrdə də bu istiqamətdə elmi araşdırmalar aparılır, nəticə etibarilə mədəniyyətin, xüsusilə mənəvi mədəniyyətin şəxsiyyət yetkinliyi üçün vacibliyi ön plana çəkilir. Bu baxımdan tədqiqatçı alim, kulturoloq Fuad Məmmədovun fikirləri maraq doğurur: “İnsan dəyərinin əsas meyarı – nə onun milliyyəti, nə dini, nə doğulduğu yer, nə yaşadığı yer, nə də ki, peşəsi, yalnız onun ruhu (əqli və mənəvi) mədəniyyətidir. Bu baxımdan elm, təhsil, tərbiyə və maarif vasitəsilə xalqın intellektual və etik mədəniyyətinin inkişafına xidmət etmədən,

ziyalıların əsl vətənpərvərliyi təsəvvür-edilməzdir" [10].

"Mədəniyyət" anlayışının latın dilindən tərcüməsi becərmək, bəsləmək, yaxşılaşdırmaq deməkdir. İlkin anlamda – torpağın becərilməsi, əkinçilik, torpağın işlənilməsi idi [7]. Tədricən insanların fəaliyyət dairəsi genişləndi və "mədəniyyət" sözü daha geniş bir məna daşımaqla insanın və cəmiyyətin inkişafının müasir səviyyəsi, insanın yaratdığı və nəsildən nəsilə ötürdüyü maddi və mənəvi dəyər anlamına gəldi. "Mədəniyyət" ("kultura") sözünü ilk dəfə XVIII əsrdə İ.X.Adelunq 1782-ci ildə yazdığı "İnsan nəslinin mədəniyyət tarixinin təcrübəsi" adlı kitabında işlətmiş və mədəniyyəti "insan ruhu" kimi təqdim etmişdir [10].

2014-cü ildə Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev "Azərbaycan Respublikasının Mədəniyyət Konsepsiyası"nın təsdiq edilməsi haqqında sərəncam imzalamışdır. Mədəniyyət sahəsində dövlət siyasəti bərabərlik, demokratiklik, humanistlik, inteqrasiya, tarazlılıq, keyfiyyətlilik, dünyəvilik, səmərəlilik, varislik və istedad amilinə əsaslanır.

Konsepsiyanın "2.1.Hüquqi təminatın inkişaf etdirilməsi" bəndində qeyd edilmişdir:

- Azərbaycan Respublikasının tərəfdar çıxdığı beynəlxalq müqavilələr çərçivəsində mədəniyyət sahəsində beynəlxalq əməkdaşlığın genişləndirilməsi;
- əqli mülkiyyət mədəniyyətinin formalaşdırılması;
- mədəniyyət sahəsində peşəkarlıq səviyyəsinin artırılması [1].

Qeyd edildiyi kimi, mədəniyyət geniş anlayışdır. Bu gün mənəvi mədəniyyətin tərkib hissəsi olan əqli mülkiyyət mədəniyyətindən də bəhs olunur. Təcrübə göstərir ki, təhsilalanlarda, tədqiqatçı gənclərdə əqli mülkiyyət mədəniyyətinin formalaşdırılması vacib məsələlərdən biri kimi diqqəti cəlb edir. Əqli mülkiyyət mədəniyyəti nədir?

"Əql" ərəb mənşəli söz olub mənası bir insanın ağlına əsaslanan, ağlına mənsub zehni işdir [6]. Yəni hər hansı bir insanın daha geniş, daha dərin və çevik mühakimə yürütməsi nəticəsində yaranan məntiqi fəaliyyətdir. Bu məntiqi fəaliyyət nəzəri və məntiqi yolla əldə olunur. Məqsəd insanın iş fəaliyyətini (praktik yeniliklərlə), yaşam tərzini (ixtiralarla) yaxşılaşdırmaqdır. Nəzəri yolla əqli mülkiyyət təhlil, tərkib, induksiya və deduksiya vasitəsilə formalaşır. Emprik yolla isə insan müşahidə aparmaqla əqli nəticəyə gəlir.

"Mülkiyyət" anlayışı da həmçinin ərəb sözü olub hər hansı bir şeyə bir və bir neçə adamın sahibliyi, mənsubluğu deməkdir [9]. Mülkiyyətçilik anlayışı o zaman yaranır ki, "mənimki" və "səninki" olanları fərqləndirmək mümkün olsun və fərqləndirmənin nəticəsi olaraq sən özününkünün istifadəsi ilə özgəninkinin istifadəsi arasında sərhəddi müəyyənləşdirməyi bacarırsan.

Deməli, əqli mülkiyyət zehn və şüurun birgə fəaliyyəti nəticəsində əldə olunan fikir və düşüncədir. O, hər hansı bir şəxsə aid olduğu üçün mülkiyyət hesab edilir və mülkiyyətin bir növü kimi qayda və qanunlar çərçivəsində qorunur.

Əqli mülkiyyət mədəniyyəti dedikdə isə əqli mülkiyyətlə bağlı müəyyən məlumatların maddi və mənəvi dəyərlərə çevrilməsi başa düşülür. Konkret bu və ya digər şəxsə aid olan əqli mülkiyyət əqli fəaliyyətin məhsulu, əqli keyfiyyətin nəticəsidir. Məhz bu xüsusiyyətlərinə görə o, həmin şəxsin mülkiyyəti hesab edilir. Digər mülkiyyət formaları kimi əqli mülkiyyət də qanunlarla qorunur. Bütün mülkiyyət formaları xüsusiyyətlərinə görə bir-birindən fərqlənir. Əqli mülkiyyəti digər mədəniyyət formalarından fərqləndirən ən mühüm cəhət onun təkrar-

çılığa yol verməməsidir. Çünki təkrarçılıq inkişafa mane olan, onu ləngidən cəhətdir. Ona görə də elmdə, yaradıcılıqda təkrarçılıq məqbul sayılmır. İnkişaf innovasiyalarla, innovativ yanaşmalara üstünlük verməklə təmin olunur. Təcrübə göstərir ki, hər bir tələbə müəyyən elmi biliklərə və bacarıqlara yiyələnərkən əldə etdiyi məlumatların əqli mülkiyyətçisini tanımalı, eyni zamanda öz əqli mülkiyyətindən istifadə qaydalarına əməl etməlidir.

Əqli mülkiyyətin qorunması məqsədilə 1995-ci il noyabrın 12-də Ulu öndər Heydər Əliyev “Müəllif hüquqları və əlaqəli hüquqlar haqqında” ilk qanunu imzaladı. Məqsəd müstəqil Azərbaycan Respublikası vətəndaşlarının elm, ədəbiyyat, incəsənət əsərlərinin və digər sahələrə dair müəlliflik münasibətlərinin tənzimlənməsinə xidmət etməkdir [2]. Qanuna 2002, 2004, 2005, 2008 və 2010-cu illərdə müəyyən dəyişikliklər edilmişdir. Bu Qanunun tətbiqi sahələri Azərbaycan Respublikasının vətəndaşlarına və Azərbaycan ərazisində daimi qeydiyyatı olan fiziki şəxslərə şamil edilir. Qanunun tələblərinə görə əqli mülkiyyətə şamil edilən əsərlər yazılı, şifahi, təsviri, həcmli-fəzavi və s. formalarda ola bilər.

Rəsmi sənədlər (qanunlar, məhkəmə qərarları və s.), dövlət rəmzləri və nişanları (bayraq, gerb, himn və s.), xalq yaradıcılığı nümunələri, günün yenilikləri, müxtəlif hadisə və faktlar barədə informasiyalar Azərbaycan vətəndaşları üçün müəlliflik hüququ kimi qorunmayan obyektlərdir. Lakin bütün bunların hamısı Azərbaycan sərhədlərindən kənarda yaşayan, başqa millətlərə və xalqlara da şamil edilə bilməz. Yəni Azərbaycan xalqına məxsus rəsmi sənədlər, dövlət rəmzləri və nişanları, xalq yaradıcılığı nümunələri, milli geyimlər və xörəklər, xalq çalğı alətləri, tarixi faktlar, arxeoloji tapıntılar, incəsənət nümunələri və s. digər xalqlar tərəfindən saxtalaşdırıla, özününküləşdirilə bilməz. Əks halda bu, Azərbaycan xalqının müəlliflik hüquqlarının pozulması kimi başa düşülür və hüquqları pozan qarşı tərəf Qanun qarşısında, yəni beynəlxalq hüquq normaları çərçivəsində məsuliyyət daşıyır.

Əqli mülkiyyət hüquqlarını qorumaq məqsədilə 1993-cü ildə Azərbaycanda ilk dəfə olaraq Müəllif Hüquqları Agentliyi yaradılmışdır. Artıq təxminən 25 ildir ki, bu agentlik fəaliyyət göstərir. Agentlik müəlliflik hüququ, əlaqəli hüquqlar, ənənəvi mədəni nümunələr, inteqral sxem topologiyaları və s. əqli mülkiyyət hüquqları sahəsində dövlət siyasətini həyata keçirən, normativ hüquqi tənzimləməni təmin edən, fəaliyyəti əlaqələndirən mərkəzi icra hakimiyyəti statusunda dövlət orqanıdır.

Təcrübə və elmi araşdırmalardan məlum olur ki, müasir dövrdə cəmiyyətdə əqli mülkiyyət mədəniyyətinin formalaşdırılmasına böyük ehtiyac vardır. Bu gün həm Azərbaycan xalqına məxsus mülkiyyətlərin qorunması, həm də başqa xalqlara məxsus mülkiyyətlərdən düzgün istifadə olunması olduqca vacibdir.

Əqli mülkiyyət mədəniyyəti hansı hallarda pozulur? Elmi araşdırmalara əsasən əqli mülkiyyət mədəniyyətinin pozulması hallarını 5 (beş) istiqamət üzrə göstərə bilərik:

1. Məlumdur ki, beynəlxalq aləmdə əqli mülkiyyət mədəniyyəti ermənilər tərəfindən çox asanlıqla pozulur. İlk növbədə Azərbaycan tarixinin erməni separatçıları tərəfindən əsassız olaraq saxtalaşdırılması.

Müəllif Hüquqları Agentliyi yarandığı vaxtdan bu kimi halların qarşısını almağa çalışmış və ciddi tədbirlər həyata keçirmiş-

dir. Belə ki, Agentlik beynəlxalq ictimaiyyəti çaşdıran faktların əsassız olduğuna dair dəyərli kitablar və məqalələr nəşr etdirmiş və bu gün də məqsədyönlü fəaliyyətini davam etdirir. Professor Kamran İmanov tariximizi özündə əks etdirən "Erməni yadelli nağılları" və "Gəldim, gördüm..., mənimsədim" və digər adlarda dəyərli əsərləri Azərbaycan, rus, ingilis və fransız dillərində nəşr etdirmişdir.

Sözləri Əhməd Cavada, musiqisi Üzeyir Hacıbəyliyə aid "Çırpınırdı Qara dəniz" adlı mahnı erməniləşdirilərək Sayat Nova adına, sözləri Mikayıl Müşfiqə, musiqisi Ələkbər Tağıyevə məxsus "Sənə qurban" mahnısının melodiyası A.Madadyanın ifa etdiyi "Garun" ("Bahar") melodiyası ilə saxtalaşdırılmışdır [3].

Müəllif Hüquqları Agentliyinin təqdim etdiyi faktlar əsasında bunların müəlliflik hüquqları bərpa edilmiş, Azərbaycan xalqının milli sərvətinə çevrilmiş bu əsərlərə, onların müəlliflərinə qarşı tarixi ədalətsizliyin, saxtakarlığın qarşısı alınmışdır.

Bundan başqa Azərbaycan xalqına məxsus xalçaların, xalq mahnısı "Sarı gəlin"in, "Tar" musiqi alətinin, milli mətbəximizə məxsus "dolma" və s. kimi yemək növlərinin də ermənilər tərəfindən saxtalaşdırılması cəhdləri olmuşdur. Bütün bunlar əqli mülkiyyət mədəniyyətinin pozulması hallarıdır və təəssüf ki, hüquqi baxımdan ermənilər hələ də cəzalandırılmamışdır.

2. Yaradıcı insanların əsərləri, ixtiraları kütləyə adətən vasitəçilərin köməyilə çatdırılır. Bu yayım təşkilatçılarının hüquqları əlaqəli hüquqlar kimi səciyyələndirilir və onların əsas xüsusiyyətləri müəllif hüquqlarından törəməsi və onlardan asılı olmasıdır. Məsələn, hər hansı bir mahnı bəstəkar tərəfindən bəstələnərək ifaçıya təqdim olunur və ya satılır, lakin bunun müəlliflik hüququ yenə də bəstəkara məxsus olur. Mahnı ifa olunduqdan sonra isə yayım təşkilatçıları və fonoqram istehlakçıları onu kütləyə təqdim etsələr də burada müəlliflik hüququ artıq ifaçıya məxsus olur. Bu yayım təşkilatlarının və fonoqram istehlakçılarının hüquqları isə piratçılıq yolu ilə pozula bilər. Fonoqram istehlakçılarına məxsus disklər nüsxələnərək daha aşağı qiymətlə satışa buraxılır. Nəticədə, yayım təşkilatlarına məxsus holoqramlı disklərin, kitabların satışı azalır. Eyni zamanda ifaçı da disklərdən heç bir qazanc əldə edə bilmir. Bütün bunların nəticəsində istifadəçilər arasında əlaqəli hüquqlar pozulur və onlara maddi və mənəvi zərər dəyir. Oxşar hadisələr elmi sahələrdə də mövcuddur. Bəzi nəşriyyatlar müəllifin icazəsi olmadan ona məxsus hər hansı bir kitabı, vəsaiti yenidən nəşr edərək satışını təşkil edir. Nəticədə nəşriyyat müəyyən bir qazanc əldə edir, əsil mülkiyyətçi isə bundan faydalana bilmir.

3. Digər bir cəhət isə əslində elə də nəzərə çarpmır. Yəni hər hansı bir müəllifə məxsus kitab və metodik vəsait tələbələr və digər istifadəçilər tərəfindən nüsxələnərək istifadə olunur. Bu əqli mülkiyyət mədəniyyətinin pozulması deməkdir. Bu zaman müəllif 500 kitabın tirajından qazanc əldə etməyi düşünürdüsə, belə hallarda o yalnız bir neçə kitabın satışından qazanc əldə edə bilir. Halbuki, o müəyyən vəsait ödəyərək öz əqli mülkiyyətinin satışını təmin etmək istəyində olur, yəni kitabın nüsxələnərək geniş şəkildə yayılması ona həm maddi, həm də mənəvi zərər gətirir.

4. Onu da qeyd etmək lazımdır ki, bəzi hallarda insan ağlının məhsulu əqli mülkiyyət hesab olunmur. O halda ki, insan beyninin məhsulu onun xalqının rifahına, dövlətin siyasətinə zidd olsun. Bu kimi halların qarşısının alınması üçün isə senzura

vardır. Yəni senzuradan keçməyən mülkiyyət əqli mülkiyyət hesab olunmur və onun müəlliflik hüquqları heç bir qanun çərçivəsində qorunmur. Senzura - (latınca, "cencura" sözündən götürülüb, XV əsrdə Avropada yaranıb) dövlətin kütləvi informasiya vasitələrinin məzmunu və yayılması üzərində nəzarətdir [15]. Senzura rəsmi və qeyri rəsmi formada aparılır. Rəsmi senzuranın məqsədi hakimiyyət əleyhinə, dövlət əleyhinə ideya və məlumatların yayılmasının qarşısını almaqdır, məhdudlaşdırmaqdır. Lakin qabaqcıl dünya ölkələri rəsmi senzuranı demokratiya əleyhinə və insanların azad düşüncə tərzinə zidd olduğunu hesab edirlər. Bu səbəbdən Azərbaycan Respublikasında rəsmi dövlət senzurası 1998-ci ildən ləğv edilib.

Qeyri-rəsmi senzura isə 2 cür olur: İlkin senzura zamanı hər hansı bir məlumat öncədən nəzərdən keçirilir. Digər senzura isə ictimaiyyətə təqdim olunduqdan sonra əsər haqqında, filmlər haqqında aparılan müzakirələrdir. Hazırda internet senzuranın ən yeni növündəndir.

4. Əqli mülkiyyət mədəniyyətinin pozulması hallarından biri də müəllifə məxsus əsərdə onun şərəf və ləyaqətinə xələl gətirən dəyişikliklərin edilməsidir. Yəni istifadə olunan əqli mülkiyyət istifadəçilər tərəfindən heç bir halda onların şəxsi istəyi əsasında dəyişdirilə bilməz.

Əqli mülkiyyət mədəniyyətinin pozulması hallarının qarşısının alınması istiqamətində aşağıdakı addımlar atılmışdır:

- Kitab nəşrlərinə dair hüquqların qorunması məqsədilə 1995-ci il ildən YUNESKO Baş Assambleyasının qərarı ilə 23 aprel Ümumdünya Kitab və Müəlliflik Hüququ Günü kimi qeyd olunmağa başladı. Artıq 2015-ci ildən bu, Azərbaycanda da qeyd olunmağa başlamışdır.

- Azərbaycan Respublikası 1995-ci ildə Ümumdünya Əqli Mülkiyyət Təşkilatına (ÜƏMT) üzv qəbul olmaqla yanaşı, "Ədəbi-bədii əsərlərin qorunması haqqında" Bern Konvensiyasına və "Müəllif hüququ haqqında" Ümumdünya konvensiyasına, Fonoqramlar üzrə Cenevrə Konvensiyasına, Roma Konvensiyasına və ÜƏMT-nin İnternet – Konvensiyalarına, MDB-nin Müəlliflik hüququ və əlaqəli hüquqların qorunması sahəsində əməkdaşlığa dair 6 ikitərəfli müqaviləyə qoşulmuşdur. Bu kimi təşkilatların dəstəyilə Azərbaycan xalqına məxsus bir sıra milli-mənəvi sərvətlər patentləşdirilmiş və onların Azərbaycan xalqına məxsusuluğu beynəlxalq aləmdə öz təsdiqini tapmışdır.

- İnteqral sxem topologiyasının hüquqi qorunması haqqında" qanun (2002-ci il).

- "Azərbaycan folklor nümunələrinin hüquqi qorunması haqqında" qanun (2003-cü il).

- "Məlumat toplularının hüquqi qorunması haqqında" qanun (2004-cü il).

- "Əqli mülkiyyət hüquqlarının təminatı və piratçılığa qarşı mübarizə haqqında" qanun qəbul edilmişdir. Azərbaycan qanunvericiliyi 09 iyun 2012-ci ildə Azərbaycan Respublikası Konstitusiyasının 94-cü maddəsinin I hissəsinin 13-cü bəndinə uyğun olaraq əqli mülkiyyət hüquqlarının müdafiəsinin təmin edilməsi, əqli mülkiyyət hüquqları sahiblərinin maraqlarının qorunması və bu sahədə hüquqpozmaların, o cümlədən müvafiq əqli mülkiyyət obyektlərinin nüsxələrinin qeyri-qanuni istehsalı və yayılmasının qarşısının alınması ilə bağlı yaranan münasibətləri tənzimləyir [9].

- Azərbaycan Respublikasının Konstitusiyasında əqli mülkiyyət hüquqları sahə-

sində Qanunlar, digər normativ hüquqi aktlar və Azərbaycan Respublikasının beynəlxalq müqavilələri sahəsində görülən işlər nəticəsində 2006-cı ildə Azərbaycan ABŞ Hökumətinin müəllif hüquqlarını pozan ölkələr siyahısından çıxarılmışdır.

"Əqli mülkiyyət hüquqlarının təminatı və piratçılığa qarşı mübarizə haqqında" Qanun imzalandıqdan sonra rəqəmli hüquqların idarə edilməsi sistemi və elektron xidmətlər yaradılmış, müəlliflik hüququ və digər əqli mülkiyyət hüquqları sahəsinin inkişafına aid Uzunmüddətli Milli Strategiya hazırlanmış, Aİ (Avropa İttifaqı) ilə Tvinninq layihəsi həyata keçirilmiş, "Azərbaycan 2020: gələcəyə baxış" İnkişaf Konsepsiyasında müəlliflik hüququ və digər əqli mülkiyyət hüquqları prioritet istiqamət kimi qəbul edilmişdir.

Əqli mülkiyyətin pozulması zamanı Azərbaycan Respublikasının Mülki Prosessual Məcəlləsində nəzərdə tutulmuş qaydalarla sübuta yetirilərsə əqli mülkiyyət sahibinin hüquqları bərpa olunur, hüquqlarının bərpası üçün vəkilə ödədiyi haqq da daxil olmaqla ona dəyən zərər qanunvericilik çərçivəsində geri ödənilir.

Apardığımız tədqiqatın mahiyyəti ali təhsil müəssisələrində tələbələrdə əqli mülkiyyət mədəniyyətini formalaşdırmaqdan ibarətdir. Əqli mülkiyyət mədəniyyətinin tələbələrdə formalaşdırılmasında məqsəd onlarda başqalarının mülkiyyətinə hörmət hissini aşılamaqdır. Çünki əqli mülkiyyət mədəniyyəti birinin hüququ, digərinin isə vəzifəsidir.

Ali təhsil müəssisələrində tələbələrdə əqli mülkiyyət mədəniyyətinin formalaşdırılması müasir dövrdə kadr hazırlığının vacib problemlərindən biri kimi də qeyd edilə bilər.

Elmi mütaliənin zəifləməsini onunla əsaslandırırıq ki, internet portallarında verilən məlumatlar tələbələrin intelektual inkişafına xidmət etməlidir. Amma çox təəssüf ki, bu əksər hallarda kortəbii istifadəyə gətirib çıxarır. İnternetdə yayımlanan başqa müəlliflərə məxsus materialları eynilə nüsxələyib istifadə etmələri onları əqli cəhətdən tənbəlləşdirir. Tələbələr araşdırmalar aparmadan, mütaliə etmədən verilən tapşırıqları yerinə yetirirlər. Həm də onların hər hansı bir sahədə araşdırmalar aparan alimlərə dair belə məlumatları olmur.

Yaradıcı təxəyyülün inkişafının ləngiməsini onunla əsaslandırırıq ki, elmi tədqiqatçılıqla bağlı ali təhsil müəssisələrində verilən tapşırıqlar zamanı tələbələr hər hansı bir mövzuyla bağlı araşdırmalar aparmaq məqsədilə bir neçə müəllifin elmi əsərlərini oxuyub ümumiləşdirmələr aparmalıdırlar. Yəni bu, sırf onların əqli məhsulu olmalıdır. Köçürməyə meyilli tələbələr başqalarının əqli mülkiyyət hüququnu pozmaqla yanaşı, özlərinin də elmi yaradıcılıq inkişafını ləngitmiş olurlar.

Özgüvənin və özünəinamın sarsılmasını onunla əsaslandırırıq ki, köçürməyə alışqanlı tələbələr müəyyən tapşırıqların verilməsi zamanı artıq özgüvənlərini itirmiş olurlar və onlar sərbəst şəkildə fikirlərini ifadə etməkdə çətinlik çəkirlər. Biz tələbələrlə əqli mülkiyyət mədəniyyətinə dair apardığımız anket sorğuları zamanı da bunun şahidi olduq. Tələbələrin əksəriyyəti anket sorğularını sərbəst şəkildə doldurmaqda çətinlik çəkirdilər və demək olar ki, çalışırdılar ki, bir-birindən köçürələr və belə hallar da oldu. Bu, onlarda tam məlumatları olmadıqları tapşırığa dair özgüvən və özünəinam hisslərinin zəifliyindən xəbər verir.

Əməyə dəyər və hörmət hissinin azlığını

onunla əsaslandırırıq ki, başqa müəlliflərin əqli mülkiyyətini eynilə nüsxələyərək öz yaradıcılığı kimi təqdim edən tələbələr demək olar ki, başqalarının əməyini dəyərləndirmirlər. Onlar bilməlidirlər ki, hər bir müəllif bu materialın ərsəyə gəlməsində müəyyən əziyyət çəkib və onun bu əziyyətinə hörmətlə yanaşmaq lazımdır.

Nəzərə alsaq ki, 2000-ci ilin statistik məlumatlarına görə dünyada il ərzində, 1 milyon adda kitab nəşr olunur, 5 minə qədər film çəkilir, 3 milyondan artıq fonoqram nüsxəsi istifadəyə verilir, 32 milyona yaxın patent sənədi və 4 milyona yaxın fəaliyyətdə olan patent, 250 min sənaye nümunəsi qeydiyyatdan keçirilir və fəaliyyətdə olan qeydiyyatlı əmtəə nişanlarının ümumi sayı 8,5 milyona çatır. Bütün bunların hər birini nəzarətdə saxlamaq təbii ki, olduqca çətindir. Düzdür, bəzi əqli mülkiyyət məhsullarının (elmi işlər, ixtiralar və s.) internet proqramlarının köməyilə aşkarlanması mümkündür, amma bunlar tələbələrin elmi yaradıcılığında nəzərə alınmır.

Ali təhsil elmin kəsişmə nöqtəsi olduğu üçün Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı Fondu ali təhsil müəssisələrinin doktorant və magistrantlarının elmi fəaliyyətini stimullaşdırmaq üçün demək olar ki, hər il qrant layihələr hazırlayır. Məqsəd ali təhsil müəssisələrində elmi potensialın innovativ infrastrukturunu inkişaf etdirməkdir. Elmi tədqiqat sahəsində çalışan tələbələrin sayı günü-gündən artır. Hazırda Azərbaycan Respublikasının müxtəlif ali təhsil müəssisələri və elmi təşkilatlarında 33 mindən çox mütəxəssis çalışır ki, onlardan da 11 min nəfərdən çoxu fəlsəfə doktoru, 2500 nəfəri isə elmlər doktorudur. Alimlərin elmi fəaliyyəti onların əqli mülkiyyətidir və onların əksəriyyəti beynəlxalq elmi ictimaiyyətə təqdim olunur və yerli mətbuatla yanaşı xarici elmi jurnallarda da dərc olunur. Bu baxımdan əqli mülkiyyətin qorunması olduqca əhəmiyyətlidir və ali təhsil müəssisələrində təhsil alan tələbələrdə əqli mülkiyyət mədəniyyəti formalaşdırılmalıdır.

Məqalənin elmi yeniliyi: Əqli mülkiyyət mədəniyyətinin təlim-tərbiyə prosesində formalaşdırılması nəzərə alınmalıdır.

Məqalənin praktik əhəmiyyəti: Məqalədə irəli sürülən fikirlər və təkliflərin ali təhsil müəssisələrində tətbiqi baxımından əhəmiyyətlidir.

***Rəyçilər: prof. A.Abbasov***
***prof. H.Əhmədov***

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan Respublikasının Mədəniyyət Konsepsiyası”nın...Bakı: www.e-qanun.az/framework/27056.

2. Azərbaycan Respublikasının Konstitusiyası. Bakı: www.azerbaijan.az/portal/General/.../constitution_01_a.html.

3. Azərbaycan Respublikasının Müəllif Hüquqları Agentliyi. Bakı: dxr.az/xidmetler/.../add9eb02-5b67-e411-bf0d-6c3be51e53.

4. Elm və təhsilin vəhdəti insan kapitalının əsasıdır - "Azərbaycan" qəzeti, 12 fevral 2016. Bakı:www.azerbaijan-news.az/index.php?mod=3&id=90089.

5. Əqli mülkiyyət - Vikipediya.Bakı: https://az.wikipedia.org/wiki/Əqli_mülkiyət.

6. Əql nədir, əql haqqında, əql mənası. Bakı: - Nedir. Az Bakı: nedir.az/əql-nedir-əql-haqqında

7. Mədəniyyət - Vikipediya Bakı: https://az.wikipedia.org/wiki/Mədəniyyət.

8. Müəlliflik Hüququ və Əlaqəli Hüquqlar haqqında.Bakı: www.wipo.int /edocs/lexdocs/laws/az/az/az003az.pdf.

9. Mülkiyyət - Vikipediya Bakı: https://az.wikipedia.org/wiki/Mülkiyyət.

10. Məmmədov F. Kulturologiya mədəniyyət sivilizasiya. Bakı: anl.az/el/ Kitab/2016/Ar2016-517.pdf.

11. Ömərov V. Azərbaycançılıq və Azərbaycanın milli mədəniyyəti. Bakı: anl.az/down/meqale/ses/2012/fevral/229690 .html.

12. Ömərov V. Azərbaycanda elm və təhsilin vəhdəti məsələsi. Bakı: sesqazeti.az/news/kivdf/626206.html. Səs qəzeti, 11 iyul, 2017.

13. Salmanlı R. Əqli mülkiyyətin qorunması müstəsna əhəmiyyət kəsb edir. Bakı:http//www.azerbaijan-news.az/index. php?mod=3&id=67892.

14. Rzayev A. Nəsirəddin Tusi (Həyatı, elmi, dünyagörüşü). Bakı, 2015.

15. Senzura - Vikipediya. Bakı: https://az.wikipedia.org/wiki/Senzura.

**И.Джабраилов,**
**К.Микаилова**

**Вопросы формирования культуры интеллектуальной собственности**

**Резюме**

В статье анализируется история культуры интеллектуальной собственности, государственные документы, взгляды выдающихся личностей и сущность культуры интеллектуальной собственности. Было заявлено, что как народ мы имеем право защищать нашу интеллектуальную собственность принадлежащую нам, а также каждому человеку. В статье также отмечается, что, когда студенты высших учебных заведений не формируют культуру интеллектуальной собственности, это ослабляет развитие их научного потенциала и препятствует их научному творчеству.

**I.Jabrayilov,**
**K.Mikayilova**

**Issues of formation of intellectual property culture**

**Summary**

The article mentions the history of intellectual property culture, state documents, the views of prominent personalities have been analyzed, the essence of intellectual property culture has been explained. It was stated that as a people we have the right to protect our intellectual property belonging to us, as well as to every person. The article also notes that, when students of higher educational institutions do not form a culture of intellectual property, this weakens the development of their scientific potential and hampers their scientific creativity.



# SİNİFDƏNXARİC TƏDBİRLƏR VƏ ŞAGİRD ŞƏXSİYYƏTİNİN FORMALAŞMASI MƏSƏLƏLƏRİ

**Tünzalə Bağırova,**
***Şamaxı şəhər 2 nömrəli tam orta məktəbin müəllimi***

***Açar sözlər:*** *sinifdənxaric tədbirlər, məktəblilərin fəallığı, meyil və maraq, qoyulan tələb.*
***Ключевые слова:*** *внеклассные мероприятия, активность школьников, интересы и предпочтения, поставленные требования.*
***Key words:*** *extracurricular activities, student activity, inclination and interest, requirements.*

Məktəbdə təlim-tərbiyə işinin düzgün qurulmasında sinif kollektivinin formalaşmasına xidmət edən sinifdənxaric tədbirlərin böyük əhəmiyyəti vardır. Müasir şəraitdə sinifdənxaric tədbirlərin təkmilləşdirilməsi istiqamətlərinin məzmunu, yəni forma və üsullarla müəyyənləşdirmək üçün xüsusən, əməyə hazırlıq, əqli, əxlaqi, fiziki, estetik, iqtisadi və ekoloji tərbiyə habelə, insan hüquqlarının hörmət əsasında hər bir məktəbli ilə bir neçə yönümdə iş aparmalıdır. İlkin olaraq, şagirdlərin tərbiyələndirici vasitlələrinin bilavasitə dərsdə və dərsdən kənar vaxtda əməli fəaliyyətini vahid sistemdə birləşdirməyin daha təsirli yollarını aşkara çıxarmalı,bu hər bir müəllimin, məktəb rəhbərinin diqqət mərkəzində olmalılıdr.

Sinifdənxaric tərbiyə işləri-şagird şəxsiyyətinin formalaşmasına və məktəbdə təlim və tərbiyə keyfiyyətinin yüksəlməsinə xidmət edir;

- Məktəblilərin təlim prosesində qazandıqları bilik, bacarıq və vərdişləri daha da zənginləşdirir və həyata tətbiq etmələrinə imkan yaradır;

- Məktəblilərin fəallığına, təşəbbüskarlığına maraq, meyil və qabiliyyətlərini inkişaf etdirir;

- Məktəblilərin asudə vaxtlarının ağıllı təşkilinə şərait yaratmaqla onları xoşagəlməz təsadüfi hadisələrdən və kənar mənfi təsirindən qoruyur;

- Şəxsiyyətlərarası əlaqələrini tənzimləyir, dostluq, yoldaşlıq kimi əxlaqi keyfiyyətlər yaradır, yaşıdları arasında əxlaqi münasibətləri cilalayır;

-Məktəblilərin sağlamlığını möhkəmləndirir;

-Məktəblilərin ictimai fəaliyyət və əmək vərdişləri ilə silahlanmasına kömək edir;

-Məktəblilərin potensial qüvvələrini, intellektual imkanlarını üzə çıxarır, yaradıcılıqlarını inkişaf etdirir, özlərini dərindən tanımalarına kömək edir;

-Məktəblilərin elm, texnikia, ədəbiyyat, incəsənət və s. sahələr üzrə əlavə məlumat əldə etmələrinə şərait yaradır.

Sinifdənxaric və məktəbdənkənar tərbiyə işi həm məktəblilərin hərtərəfli və ahəngdar inkişafına kömək edir, həm də onların fərdi istedad və qabiliyyətlərini daha vüsətlə formalaşdırılmalarına optimal yardım göstərir.

Sinifdənxaric şəraiti öyrənmək və şagirdlərin maraqlarını müəyyənləşdirmək yalnız işin ilkin mərhələsidir. Əsas məsələ isə sinifdən xaric işlərin təşkili və buna daha çox şagirdlərin cəlb olunması və bu işlərin keyfiyyətinin yüksəldilməsidir. Şagirdlərin hərbi-vətənpərvərlik tərbiyəsində sinifdən-xaric və məktəbdənkənar işlərin forma və üsulları müxtəlif və rəngarəng olur. Məsələn, Azərbaycan ordusunun yaradılması günü, 9 May-Qələbə günü və s. tarixi günlərə hazırlıq görülməsi və təntənəli sürətdə qeyd olunması, hərbi hissələrə, döyüş yerlərinə, qəhrəmanların abidələrinə ekskursiyaların təşkili, Qarabağ müharibəsi veteranları və Azərbaycan ordusunun döyüşçüləri ilə görüşlərin keçirilməsi gənc nəslin milli şürunun inkişafına öz təsirini göstərir. Hərbi-vətənpərvərlik mövzularında aparılan söhbətlər, ədəbi-bədii gecələr, müzakirələr keçirmək, şəkilli albomlar, fotosərgilər, fotoalbomlar təşkil etmək və s. gənc nəslin milli şüurunun təşəkkül tapmasına təsir göstərən vasitələrdir. Məktəblərdə bu vasitələrin hər birindən müntəzəm istifadə olunur ki,bunlar da şagirdlərdə hərbi-vətənpərvərlik tərbiyəsinin qüvvətləndirilməsinə səbəb olur. Sinifdənxaric və məktəbdənkənar tədbirlər sistemində qəhrəmanların abidələrinə, tarixi döyüş yerlərinə, hərbi hissələrə ekskursiyaların hərbi-vətənpərvərlik tərbiyyəsində rolu böyükdür. Bunu nəzərə alaraq, şagirdlərin mütəmadi şəkildə milli qəhrəmanların abidələrini ekskursiyaya aparmaq çox vacibdir. Belə abidələrin önündə qəhrəmanlar haqqında söhbətlər aparılır, abidənin üzərində əklillər qoyulur. Bu, gənc nəslin yaddaşında dərin iz buraxır.

Gənc nəslin əxlaq tərbiyəsi sahəsində məktəbin qarşısında duran ən mühüm vəzifələrdən biri hərbi-vətənpərvərlik tərbiyəsidir. Hərbi-vətənpərvərlik tərbiyəsi mənəviyyat tərbiyəsinin ayrılmaz hissəsidir. Şagirdlərimizə vətənimizin şərəfini və azadlığını qoruyub saxlamış Azərbaycan Silahlı Qüvvələrinin şanlı tarixi, onun vətən və bəşəriyyət qarşısında xidmətləri ilə yaxından tanışlıq vacibdir. Onlara sülh və azadlıq ordusu olan Azərbaycan ordusuna məhəbbət aşılamaq vətənimizin müdafiəsi uğrunda mübarizəyə hər dəqiqə hazır olmaq əzmini qüvvətləndirmək və s. hərbi-vətənpərvərlik tərbiyəsinin ən mühüm tərkib hissələrindən biridir. Məktəblərdə ona nail olmaq lazımdır ki, hər bir gənc doğma ana vətənin müdafiəsi naminə, onu çətinliklər gözləsə də, əlindən gələni əsirgəməsin, onun şərəfli hərbi xidmət, Azərbaycan ordusunun həyatı, qəhrəmanlığı və s. maraqlandırsın. Məhz buna görə də hazırki şəraitdə hərbi-vətənpərvərlik tərbiyəsi ümumdövlət işinin mühüm bir sahəsinə çevrilmişdir.

Biz iqtisadiyyatımızın, mədəniyyətimizin, sosial və mənəvi həyatımızın inkişafı yollarının müəyyənləşdirilməsinə hansı mövqelərdən yanaşırıqsa yanaşaq, insanın özü, onun siyasi və intellekt siması, ustalığı, vətənpərvərliyi və beynəlmiləlçiliyi, yaradıcılıq qabiliyyəti, vətəndaşlıq mövqeyi və fəallığı həmişə həlledici amil olacaqdır. Məlumdur ki, uşaqlıq illərinin təəssuratları ilə zəngininsanın təxəyyülü, dünyaya baxışı, mühakimə dairəsi geniş olur. Uşaqlıq illərinin izi bütün ömürdən qırmızı xətt kimi keçir, insanın xarakteri bu ilkin zəmin üzərində inkişaf edir. Bu dövürdə uşaq həyatını parlaq, mənalı keçməsi, ona uyğun

yeni biliklərin emosiyanal şəkildə verilməsi, onun lüğət ehtiyyatlarının zənginləşdirilməsi, dil qabiliyyətinin inkişaf edilməsi nə qədər vacibdir. Təlim-tərbiyə işi elə qurulmalıdır ki, hər bir dərs, hər bir tədbir şagirdlər üçün bayrama çevrilsin. Bu tədbirlər şagirdlər üçün də mühüm əhəmiyyətə malikdir. Belə ki, şagirdlər sinifdənxaric və məktəbdən kənar tədbirlərin fəal iştirakçısı və yaxud bilavasitə icraçısı olduqlarından tədbir onların nitq mədəniyyətinə qüvvətli təsir göstərir. Sinifdənxaric tədbirlər sagirdin idarəetmə vərdişlərinin formalaşdırılmasına, elmi dünya görüşünün genişləndirilməsinə, onda əsl Azərbaycanlıya xas olan yüksək mənəvi və əxlaqi keyfiyyətlərin formalaşmasına imkan yaradır. Şagirdin asudə vaxtını səmərəli vaxtının təmin etməklə yanaşı, sinifdə müəyyən fənlərdən verilmiş biliyi dərinləşdirir, şagirdlərin meyil və qabiliyyətlərini müəyyənləşdirib üzə çıxarır.

İbtidai sinif müəllimi olaraq şagirdlərimi sinifdənxaric tədbirlərə sövq edirəm. Onların dünya görüşünün artmasında,vətənə sevgisində, özündən böyük və kiçiklərə qayğı və s. kimi hisslərin formalaşmasında sinifdənxaric tədbirlərin əhəmiyyəti böyükdür.

***Rəyçi: dos. H.Cəfərov***

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan Respublikasında təhsilinin kişafı üzrə Dövlət Strategiyası. //Azərbaycan məktəbi, 2013, №5.

2. Azərbaycan Respublikasında təhsilin Milli Kurikulumu. Bakı, 2006.

3. Azərbaycan Respublikasında ümumi təhsil sistemində Qiymətləndirmə Konsepsiyası. // Kurikulum, 2009, №2.

4. Ümumi təhsilin fənn standartları (I-XI siniflər). Bakı, 2012.

5. Əlizad Ə. Şagirdlərin yaradıcı fəaliyyətinin psixologiyası. Bakı, 1968.

6. Əlizadə Ə. Şagirdlərdə təxəyyülün inkişafı. Bakı, 1965.

**Т.Багирова**

**Внеклассные мероприятия и вопросы формирования личности ученика**

**Резюме**

В статье говорится об организации внеклассных работ о том,как привлечь учащихся к мероприятиям и влияние их на развитие национального осмысления.

**T.Baghirova**

**Extra-curricular activities and questions of student's personality formation**

**Summary**

The article refers to the orqanization of extracurricular activities, how to attract students to them and the impact of these activities on the development of the national consciousness.

# FƏNNİN TƏDRİSİNDƏ PRAKTİK METODLARIN TƏTBİQİ

**Aynur Zülfüqarova,**
***Xəzər Universiteti, Dünya məktəbi***

Məqalədə kimya fənninin tədrisində praktik metodların növləri, onların tətbiqi yolları, təşkili və keçirilməsi üsulları təhlil edilmiş və onların aparılması üsulları göstərilmişdir.

***Açar sözlər:*** *nümayiş təcrübələri, laboratoriya işləri, praktik işlər, tədqiqatçılıq, sosiometrik metod, təlimat.*
***Ключевые слова:*** *демонстрация практики, лабораторные работы, практическая работа, исследование, социометрический метод, инструкции.*
***Key words:*** *demonstration of practices, laboratory work, practical work, research, sociometric method, instruction.*

Başqa digər fənlərdən fərqli olaraq kimya fənninin tədrisi zamanı praktik metodlardan da istifadə etmək imkanları daha çoxdur. Kimya fənninin tədrisində istifadəsi mümkün olan praktik metodlara aşağıdakılar aiddir:

1. Nümayiş təcrübələri
2. Laboratoriya işləri
3. Praktik işlər

Nümayiş təcrübələri fənn müəllimi tərəfindən aparılır. Yeni materialın nümayiş təcrübələri vasitəsilə tədris edilməsi şagirdlərdə mənimsəmə qabiliyyətini artırır, onların tədqiqatçılıq qabiliyyətini formalaşdırır, həmçinin, onlarda dərsə maraq oyadır. Nümayiş təcrübələri həm mövzunun möhkəm və şüurlu surətdə möhkəmləndirilməsinə səbəb olur, şagirdləri dərsdə diqqətli olmağa səfərbər edir, həm də yorğunluğun qarşısını alır və məktəbliləri tədqiqata alışdırır.

Nümayiş təcrübələri zamanı müəllim həmçinin aşağıdakı didaktik prinsipləri nəzərə almalıdır:

1. Müəllim nümayiş təcrübəsinə ciddi hazırlaşmalıdır. Təcrübə zamanı hər hansı bir müvəffəqiyyətsizlik müəllimi nüfuzdan salır.
2. Nümayiş təcrübələri düzgün təşkil edilməli, şagirdlərin qavraya biləcəyi səviyyədə olmalıdır.
3. Nisbətən qorxulu təcrübələr nümayiş etdirilərkən müəllim reaksiyaya girən maddələrin nisbətinin dəqiqliyinə, təmizliyinə fikir verməli və təhlükəsizlik texnikası qaydalarına əməl etməlidir.
4. Nümayiş təcrübələri həm şagirdləri maraqlandırmalı, onların anlaya biləcəyi səviyyədə olmalı, həm də şagirdlərə əməli vərdiş aşılamalı, səliqəli olmaq, işə həvəs göstərmək, tədqiqatçılığa meyil etmək bacarığı və s. aşılamalıdır.
5. Təcrübənin qoyuluşu üsulundan asılı olmayaraq, onun əsas cəhətlərini şagirdlər kimya dəftərlərində qeyd etməli və axırda müəllimə hesabat verməlidirlər.
6. Hər bir təcrübə şagirdləri praktik fəaliyyətə hazırlamaq, onlara kimyəvi

maddələri xarici əlamətlərinə, fiziki xassələrinə və sadə reaksiyalara əsasən tapmaq vərdişini aşılamaq məqsədini güdməlidir.

7. Demonstrasiya təcrübəsi və laboratoriya məşğələləri şagirdləri tədqiqata, müstəqil çalışmağa və nəticə çıxartmağa alışdırmalıdır.

8. Lazımi miqdarda reaktivlər əldə etmək çətin olduğu hallarda müəllim az, bəzən ən cüzi miqdarda reaktivlərlə işləməyi bacarmalı və onu şagirdlərə öyrətməlidir.

Nümayiş təcrübələri aşağıdakı hallarda aparılır:

– kimya təliminin ilk mərhələsində, şagirdlərin müstəqil şəkildə kimyəvi təcrübə aparmaq vərdişləri olmadıqda;

– təcrübənin aparılması mürəkkəb texniki təchizat təşkili və keçirilməsi dəqiqlik tələb etdikdə;

– vaxta və reaktivlərə qənaət etmək tələb olunduqda;

– təhlükəsizlik texnikası baxımından təcrübədə istifadə olunacaq maddələrlə şagirdlərin işləməsi məsləhət görülmədikdə;

– xarici effektivliyinə və inandırıcılığına görə təcrübəni nümayiş etdirməyə üstünlük verildikdə.

Şagirdlərin laboratoriyalarda yerinə yetirdikləri təcrübələrdən çıxarılan nəticələrə əsasən onlara yeni bilik verilirsə, belə təcrübələrə laboratoriya işləri (məşğələləri) deyilir. Yeni materialın şagirdlər tərəfindən mənimsənilməsində laboratoriya işlərinin rolu xeyli yüksəkdir.

Əgər şagirdlərin hamısına ayrı-ayrılıqda cihaz, reaktiv, kimyəvi qablar və s. verilmişsə və hər şagird proqramda nəzərdə tutulmuş eyni təcrübəni təklikdə aparırsa, belə formaya frontal laboratoriya işi deyilir. Laboratoriya məşğələsi nadir hallarda fərdi qaydada da (üçüncü forma) təşkil oluna bilər. Bu halda müəllim hər bir şagirdə bir sıra fərdi tapşırıq verir. Şagird həmin tapşırığı yoldaşlarından asılı olmayaraq, fərdi qaydada sərbəst halda yerinə yetirir. Əgər tapşırıq 4-5 nəfərdən ibarət qruplar tərəfindən aparılırsa, belə formaya briqada laboratoriya işi deyilir.

Laboratoriyada aparılan təcrübələrdən bilik və bacarığı möhkəmləndrimək üçün istifadə olunursa, bu cür təcrübələrə praktiki məşğələ deyilir. Başqa sözlə, praktki məşğələ irəlicədən öyrədilmiş təlim materialı üzrə keçirilən, xüsusi tərtib olunmuş təlimata və ya dərslikdəki göstəricilərə əsasən şagirdlər tərəfindən müstəqil surətdə yerinə yetirilən şagird eksperimentidir.

Şagirdlərin qruplara ayrılması üçün müxtəlif üsullardan istifadə etmək mümkündür.

Şagirdləri qruplara bölmək üçün aşağıdakı bir neçə üsulu bilmək lazımdır:

“Say”. Şagirdlərdən “1”-dən “5”-ə kimi saymaq xahiş olunur. Eyni rəqəmli iştirakçılar (bütün “birlər”, bütün “ikilər” və s.) bir qrupda birləşirlər.

“Püşkatma”. Müəllim şagirdlərin adlarını balaca vərəqlərdə yazır, qatlayır, paketə qoyur, qarışdırır və paketdən çıxararaq şagirdlərin sayına görə hər stolun üstünə qoyur. Kağızlar açılır və şagirdlərin adları oxunur. Həmin qayda ilə şagirdlər paketdən müxtəlif rəngli vərəqləri çıxara bilərlər. Rənglərin sayı və hər rəngdən olan vərəqlərin sayı qrupların sayına və kiçik qrupun nümayəndələrinin sayına görə planlaşdırılır.

“Sosiometrik metod”. Qrupların sayına görə bir neçə iştirakçı lövhənin qarşısına çağırılır. Hər iştirakçı özünə bir nəfər qrup yoldaşı seçir. Öz növbəsində hər növbəti

gələn şagird öz qruplarına bir nəfər seçir.

Fəal interaktiv təlim mühitində laboratoriya və praktik işlərin təşkili.

Laborator məşğələlərin təşkili və keçirilməsi metodikası.

Laborator məşğələlərin məqsədi – yeni materialın öyrənilməsi ilə yeni biliklərin əldə edilməsidir.

Kimyadan laborator təcrübələri fərdi (təcrübələri bütün şagirdlər fərdi yerinə yetirirlər), qrupla (eyni stol arxasında oturmuş şagirdlər eyni işi icra edirlər, lakin funksiyalar aralarında bölüşdürülür) və kollektiv (müxtəlif stollar arxasında oturmuş şagirdlər müxtəlif işləri icra edir, alınmış nəticələr barədə hesabat verirlər) şəkildə yerinə yetirilir.

Laboratoriya işlərinin icrası metodikası aşağıdakı kimidir:

1. Lazımi nəzəri biliklərin aktuallaşdırılması (müsahibə).

2. Eksperimental yolla həll olan problem və ya məsələnin qoyulması.

3. Təcrübənin yerinə yetirilmə planı ilə tanışlıq (şifahi və ya yazılı təlimat).

4. Eksperimentin yerinə yetirilmə texnikası barədə şagirdlərin suallarına müəllimlərin cavabları.

5. Şagirdlərin müstəqil işi.

6. Təcrübədən çıxan nəticələrin formalaşdırılması və müzakirəsi.

Təcrübələrin yerinə yetirilməsi zamanı şagirdlərin işinin keyfiyyəti aydın və tam təlimatlandırmadan asılıdır.

Praktiki məşğələlərin təşkili və keçirilməsi metodikası

Laboratoriyada aparılan təcrübələrdən bilik və bacarığı möhkəmləndirmək üçün istifadə olunursa, bu cür təcrübələrə praktik məşğələlər deyilir.

Praktik məşğələlərin iki növü mövcuddur: təlimat üzrə aparılanlar və eksperimental məsələlərin həlli.

Təlimat ürə aparılan praktik məşğələlər – şagirdin fəaliyyətinin istiqamətverici əsası olub, yerinə yetirilən təcrübələrin mərhələlərni ifadə edir.

Təlimata daxildir:

– Yerinə yetirilməsi vacib olan əməliyyatların siyahısı.

– Əməliyyatların yerinə yetirilmə ardıcıllığı.

– Verilən işdə tələb olunan texniki təhlükəsizlik qaydaları.

– Lazımi avadanlığın siyahısı və şəkli.

– Müşahidənin necə qeyd olunmasına göstəriş (hesabat).

Təlimat materialları aydın, qısa və əyani olmalıdır. Təlimatda artıq izah edilmiş əməliyyatlar və onların yernə yetirilmə qaydaları sonradan ətraflı göstərilmir, yalnız adları çəkilir.

Adətən, ilk işlər üçün təlimatlar çox ətraflı olur, çünki şagirdlər hələ kifayət qədər lazımi vərdişlərə malik olmurlar. Şagirdlər təlimatın köməyi ilə müəllimin rəhbərliyi altında müşahidə etməyi, müşahidələrin qeydiyyatını aparmağı, nəticələr çıxarmağı öyrənirlər. Təlimat tədricən işin aparılma planına çevrilir və nəhayət, bəzi hallarda şagirdlərə yalnız tapşırıq verilir. Şagirdlərin bilik, bacarıq və vərdişləri çoxaldıqca, müəllimin şagird eksperimenti üzərində rəhbərliyi də tədricən zəifləyir. Şagird eksperimenti tədricən müstəqil forma alır.

Buna baxmayaraq, hətta ətraflı təlimat mövcud olduqda belə ilkin mərhələdə müstəqil olaraq işin məqsədini müəyyənləşdirmək, işi planlaşdırmaq, nəticələr çıxarmaq şagirdlər üçün çətindir. Təcrübə göstərir ki, praktiki məşğələlərə təlimatın ev

şəraitində öyrənilməsi az effektlidir. Hər mərhələdə tapşırığın qısa ifadəsi ilə dəqiq icra mexanizmlərinin olması vacibdir.

***Rəyçi: prof. M.Abbasov***

## İstifadə edilmiş ədəbiyyat

1. Abbasov M., Əliyev A., Fərəcov M., Əliyev V. Ümumtəhsil məktəbləri üçün kimya fənni üzrə təhsil proqramı (kurikulumu). (VII-XI siniflər üçün). Kimya məktəbdə. 2-3 (46-47) 2014, s.4-149.
2. Təhsilin konseptual problemləri. Bakı, 2008.
3. Yeni təhsil proqramlarının (kurikulumların) tətbiqi məsələləri. Bakı, 2014.
4. Ümumtəhsil fənlərinin tədrisinə dair tədqiqlər. Bakı, 2017.

**А.Зульфугарова**

**Применение практических методов в преподавании предмета**

**Резюме**

В статье анализируются типы практических методов в преподавании химии, методы их применения, организации и проведения практических методов, а также инструкции по их реализации.

**A.Zulfugarova**

**The application of practical methods in teaching subject**

**Summary**

The article analyzes the types of practical methods in the teaching of chemistry, methods of their application, organization and conduct, and methods of their implementation.

* * *



# İLK PEŞƏ İXTİSAS TƏHSİLİ: TƏŞƏKKÜLÜ VƏ İNKİŞAF PERSPEKTİVLƏRİ

**Həsən Bayramov,**
***Dəmir Yolu və Metropoliten üzrə Bakı Dövlət Peşə Təhsil Mərkəzinin direktoru, pedaqogika üzrə elmlər doktoru***

Məqalədə texniki-peşə təhsil sisteminin təşəkkül tapmasının tarixi mərhələləri təhlil olunur. Həmçinin sosial-iqtisadi şərtlər ölkədə peşə təhsil sisteminin inkişafında ciddi amil kimi qiymətləndirilməklə, perspektivlərdən bəhs olunur. Bu sahədə ölkədə həyata keçirilən təhsil siyasətinin başlıca prioritetlərinə istinadən sahənin elmi-praktik mənzərəsi yaradılır.

***Açar sözlər:*** *peşə təhsili, peşə təhsili sistemi mərhələləri, ilk peşə ixtisas təhsilin modernləşdirilməsi.*
***Ключевые слова:*** *профессиональное образование, этапы развития системы профессионального образования, модернизация начального профессионального образования.*
***Key words:*** *vocational education, stages of vocational education system forming, modernization of initial vocational education.*

Son illər ərzində Azərbaycan Respublikasında təhsilin inkişafı istiqamətində mühüm nailiyyətlər əldə edilmiş, ölkədə təhsilin müasir tələblərə cavab verən normativ hüquqi bazası yaradılmışdır. Sosial-iqtisadi həyatın müasirləşdirilməsində təhsilin rolu təkcə təhsilalanın qazandığı bilik və bacarıqların iqtisadi amilə çevrilməsi ilə məhdudlaşmır. Təhsil prosesində əldə olunan bilik və bacarıqlar, həmçinin etik-əxlaqi norma və dəyərlər cəmiyyətin layiqli üzvü olması üçün hər bir təhsilalana lazımi şərait yaradır, onu biliyi və etik davranışı sayəsində nümunəvi həmkara, ailə üzvünə və vətəndaşa çevirir.

Müasir şəraitdə peşə təhsilinin modernləşdirilməsi cəmiyyətin və iqtisadiyyatın innovativ inkişaf yoluna keçidinin təməli kimi qəbul olunur. Təhsil cəmiyyətdə innovasiya proseslərinin katalizatoru, iqtisadiyyatın və dövlət sisteminin səmərəli yeniləşməsinin ciddi amilinə çevrilmişdir. İndi peşə təhsilində modernləşdirilmənin əsas məqsədi təhsil sisteminin sabit inkişafı üçün sosial-iqtisadi mexanizmlərin yaranmasından ibarətdir. “Həmin mexanizmlər təhsilin əlverişli olmasını, təhsilin keyfiyyətini və səmərəliliyini şəxsiyyətin, iqtisadiyyatın və cəmiyyətin tələblərinə uyğun şəkildə təmin etməlidir” [9].

Təhsil həmişə insanın aktual sosiallaşması və nəsillərin varisliyinin zəmanəti kimi çıxış edir. Azərbaycanın ilk peşə ixtisas təhsili hazırda irəliləyən islahatlar mərhələsindədir. Həmin islahatlar ölkədə peşə təhsilinin beynəlxalq standartlara uyğunlaşdırılması və humanistləşməsi məqsədi ilə, elmi-pedaqoji biliklərin və tarixi təcrübənin sintezi əsasında aparılır.

Peşə təhsilinin təşəkkül tapması

təcrübəsinin öyrənilməsi ən üstün milli ənənələri qouyub saxlamağa, onun tətbiqinə yeni yanaşmaları işləyib hazırlamağa imkan verir və xarici təcrübənin birtərəfli və tələsik yamsılamaqdan irəli gələn səhvlərin qarşısını ala bilər. Bu mənada “ilk peşə ixtisas təhsilinin tarixi təcrübəsinin tətbiq edilməsi həmin inkişafın sosial-iqtisadi, sosial-mədəni, mental, nəzəri-metodolojı, təşkilatı-pedaqojı və başqa şərtlərinə obyektiv yanaşmaya uyğun gəlir” [11, səh.163].

Bazar iqtisadiyyatına keçilməsi ilk peşə ixtisas təhsili sisteminin qarşısında yeni vəzifələr qoymuşdu. Həmin məqsəd və vəzifələrin yerinə yetirilməsi peşə təhsili sisteminin əsaslı islahatı ilə mümkündür.

Bu islahatları qarşılıqlı əlaqədə olan iki proses kimi yəni mövcud təhsil sisteminin təkmilləşməsi və təhsil sisteminin inkişafına qarşı yeni, konseptual yanaşmaların və şəraitin formalaşması kimi başa düşmək lazımdır. Həmin proseslər dövlətin iqtisadiyyatda və sosial siyasətdə apardığı struktur dəyişikliklərə uyğun, proqnozların və strateji istiqamətlərin əsasında baş verməlidir. Çünki “peşə təhsilinin yeni sistemi insan şəxsiyyətinn bir peşəkar kimi ömür boyu təkmilləşməsini nəzərdə tutur. Buna görə, peşə təhsili aşağıdakı vəzifələri yerinə yetirməlidir:

- hər bir şəxsə təhsildə onun bacarığı, tələbləri və imkanlarına uyğun olan seçim azadlığı vermək;
- sifarişçilərin çevik, bazar münasibətlərinə uyğun olan mütəxəssislərə, peşəkar kadrlara olan tələbatını nəzərə almaq;
- öz orijinal təhsil proqramlarını yaradan peşə təhsili müəssisələrinin fəaliyyətində demokratik azadlıqları təmin etmək.

Sadalanan aspektlər peşə təhsilinin inkişafında güclü stimula çevrilmişdi. Son illərdə baş verən sosial-iqtisadi dəyişikliklər “köhnə” keyfiyyətin yaxşılaşmasında deyil, daha çox təhsildə əvvəl mövcud olan cəhətlərdən prinsipcə fərqlənən yeni əlamətlərin, xarakteristikaların əlavə edilməsi haqqında söhbət açmağa əsas verir. Hazırda geniş mənada peşə təhsili sisteminə beş pillə daxil edilir: ilk, orta, ali, ali məktəbdən sonrakı və əlavə (ikinci) təhsil. Peşəkarların hazırlığında birinci pilləni-ilk peşə ixtisas təhsili təşkil edir. İlk peşə ixtisas təhsili müəssisələrinin əsas məqsədi ictimai faydalı əməyin bütün istiqamətləri üzrə, dövlətin təsdiq etdiyi ixtisas siyahısına uyğun olaraq ixtisaslı fəhlə və qulluqçuların hazırlanmasından ibarətdir.

İlk peşə ixtisas təhsili müasir dövrdə bütün təhsil sisteminin bütövlükdə modernləşdiriləsinin əsas istiqamətlərinən birini təşkil edir [11,13]. Buna görə ibtidai və orta peşə təhsili dövlət təfərindən dəstəklənməklə yanaşı, sahibkarlar tərəfindən də dəstəklən-məlidir ki, peşə təhsili sahəsində hazırlıq keçən mütəxəssislər sonralar praktiki fəaliyyətdə tələb olunsun. Ondan əlavə, qloballaşma kontekstində ali peşə təhsili biliklərin sistemli generatoru və onları yayılma vasitəsi olaraq, bəşər inkişafının, təkamülünün mütərəqqi, əsas hərəkətverici qüvvəsi kimi çıxış edir. Çünki onun inkişafı ilk peşə ixtisas təhsilinə də təkan verir. Müasir cəmiyyətdə təhsilin rolu getdikcə artır və təhsil hər bir millətin insan kapitalının durumunu, vəziyyətini müəyyən edir.

Bazar iqitsadiyyatının və sosial dəyişikliklərin nəticəsində ölkəmizin ali peşə təhsil sistemi islahat dövrünü, idarəetmə mexanizmlərinin modernləşdirilməsi mərhələsini yaşayır. Həmin dəyişikliklər həm daxili sosial-iqtisadi, həm də qlobal təsirlə, dünya təhsil məkanına inteqrasiya olmaq tələbi ilə

şərtlənir. Azərbaycanda peşə təhsilinin modernləşdirilməsi ali təhsil sisteminin beynəlxalq srtandartlara uyğunlaşdırılması yolu ilə, onun transformasiyası hesabına baş verir.

Azərbaycanda baş verən və peşə təhsili sistemini dəyişdirən islahatlar peşə təhsilinin modernləşdirilməsi siyasəti olaraq artıq dövlət siyasətinin aparıcı elementinə çevrilir. Təhsil sahəsi daim dəyişməkdə və təkmilləşməkdədir, çünki peşə təhsilinin əsas məqsədi – yüksək səviyyəli və müxtəlif profilli ixtisaslı işçilərin hazırlanmasından ibarətdir. Belə işçilər əmək bazarında rəqabət qabiliyyətli, məsuliyyətli, bilikli, öz sənətində və həmhüdud sahələrdə səriştəli, ixtisası üzrə dünya standartlarına uyğun səmərəli işləyə bilən kiçik mütəxəssis olmalıdır. Bu mütəxəssis öz peşəsində təkmilləşməyə, sosial və peşəkar çevikliyə, nəhayət, müvafiq təhsil almaq üçün daxili tələbatını ödəməyə hazır olmalıdır.

Peşə təhsili o cümlədən ilk peşə ixtisas təhsil müəssisəsinin divarlarından kənarda baş verən hadisələrdən təcrid olunmuş şəkildə inkişaf edə bilməz. Ölkənin inkişafının müasir mərhələsində ilk peşə ixtisas təhsili iqtisadi yüksəlişdə, xalq təsərrüfatının səmərəliliyi və rəqabət qabiliyyətinin artdığı şəraitdə getdikcə daha güclü hərəkətverici qüvvəyə çevrilir. Bu da ilk peşə ixtisas təhsilini ölkədə milli asayişin və firavanlığın, hər vətəndaşın rifahının əsas amillərindən birinə çevrilir. İqtisadiyyatın və sosial sahənin, elmin, texnikanın, yüksək texnologiyaların, mənəvi və regional əmək bazarlarının və onların inkişafının perspektiv tələbləri ilk peşə ixtisas təhsilinin yeniləşməsində əsas amil kimi çıxış edir.

Məhz buna görə, ölkəmizdə ilk peşə ixtisas təhsili sistemi inkişafdadır, bu inkişaf cəmiyyətin tələblərindən, sosial-iqtisadi şərtlərdən asılı olmaqla müasir kadrlara tələblərin dəyişməsinə həssaslıqla cavab verir. Bu məqsədlə ilk peşə ixtisas ilə bağlı ölkədə həyata keçirilən son addımlar xüsusilə nəzərə alınır.

Perspektiv imkanlar. Azərbaycan Respublikası Nazirlər Kabinetinin 1996-cı il tarixli "Azərbaycan Respublikasında ilk peşə-ixtisas təhsili sisteminin təkmilləşdirilməsi tədbirləri haqqında", Azərbaycan Respublikası Prezidentinin 2007-ci il 3 iyul tarixli "Azərbaycan Respublikasında texniki peşə təhsilinin inkişafı üzrə Dövlət Proqramı (2007–2012-ci illər)", 2013-cü ildə qəbul edilmiş "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası", nəhayət, Azərbaycanda peşə təhsilinin inkişafının təmin edilməsi istiqamətində görülən məqsədyönlü tədbirlərin tərkib hissəsi kimi, Azərbaycan Respublikası Prezidentinin 2016-cı il 20 tarixli Fərmanına müvafiq olaraq Azərbaycan Respublikasının Təhsil Nazirliyi yanında Peşə Təhsili üzrə Dövlət Agentliyinin yaradılmasını xüsusilə qeyd etməliyik. Bu Fərmanla Agentliyin Əsasnaməsi təsdiq edilmiş, onun fəaliyyət istiqamətləri, vəzifələri, hüquqları və fəaliyyətinin təşkili ilə bağlı məsələlər müəyyən olunmuşdur. Təhsil Nazirliyinin təkliflərinə əsasən Nazirlər Kabineti tərəfindən "Bakı və Gəncə şəhərlərində yerləşən ilk peşə-ixtisas təhsili nüəssisələri şəbəkəsinin rasionallaşdırılması haqqında" qərarla 32 ilk peşə-ixtisas təhsili müəssisəsi rasionallaşdırılaraq 13 peşə-təhsil mərkəzi yaradılmışdır".

Agentliyin Əsasnaməsində deyildiyi kimi: " ixtisaslı kadrların hazırlanmasını və onların rəqabət qabiliyyətinin artırılmasını təmin etmək, ...ilk peşə-ixtisas təhsilini əmək bazarının tələblərinə fasiləsiz uyğun-

laşdırmaq, ...ilk peşə-ixtisas təhsili müəssisələrində peşə hazırlığının səmərəliliyini artırmaq məqsədi ilə işəgötürənlərlə birgə dövlət-biznes əməkdaşlığı çərçivəsində proqramların hazırlanmasını və həyata keçirilməsini təmin edir” [2].

Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyasında deyildiyi kimi: “Azərbaycan Respublikasının inkişaf konsepsiyasına uyğun olaraq şəxsə hərtərəfli bilik və bacarıqların verilməsi məqsədi ilə təhsil sisteminin institusional əsasları, infrastrukturu və insan resursları inkişaf etdirilməlidir. Təhsilin inkişafı ölkədə əhalinin rifahının yaxşılaşması, həmçinin fərdin həyatının daha yüksək səviyyədə qurulması üçün zəmin yaradır... Sosial-iqtisadi həyatın müasirləşdirilməsində təhsilin rolu təkcə təhsilalanın qazandığı bilik və bacarıqların iqtisadi amilə çevrilməsi ilə məhdudlaşmır. Təhsil prosesində əldə olunan bilik və bacarıqlar, həmçinin etik-əxlaqi norma və dəyərlər hər bir təhsilalanın cəmiyyətin layiqli üzvü olması üçün lazımi şərait yaradır, onu biliyi və etik davranışı sayəsində örnək ola biləcək həmkara, nümunəvi ailə üzvünə və vətəndaşa çevirir. Təhsil insanlara texnologiyaları çevik mənimsəmək, əmək bazarında layiqli yer tutmaq və ömür boyu təhsil prosesinə qoşulmaq, sağlam həyat tərzi, ətraf mühitə münasibətdə düzgün mövqe seçmək imkanı verir” [1].

Ölkə Prezidentinin Fərmanı ilə təsdiq olunmuş “Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi” tamamilə zamanında qəbul olunmuş, dövlətin əvvəlki hüquqi aktlarını tamamlayan və ölkəmizin iqtisadi inkişafının perspektivlərini müəyyən edən konseptual sənəddir.

Burada insan kapitalının inkişafına modrn yanaşmanın təmin edilməsi, Azərbaycanın müstəqillik yolunda uğurları təhsilin maddi-texniki və tədris-metodiki bazasının möhkəmləndirilməsi də təhsil siyasətinin başlıca prioritetlər olaraq təsbit edilir. Bu barədə Azərbaycan Respublikasında peşə təhsili və təliminin inkişafına dair Strateji Yol Xəritəsində inkişafın prioritetləri geniş əhatə olunmuşdur. Peşə təhsilinə həmin sənəddə xüsusi olaraq yer verilməsi bu sahənin qarşısında yeni perspektivlər açmaqdadır.

Azərbaycan Respublikasında peşə təhsili və təliminin inkişafına dair Strateji Yol Xəritəsində deyilir: “Peşə təhsili rəqabətqabiliyyətli iqtisadiyyatın və inkişaf etmiş cəmiyyətin təşəkkül tapmasında böyük əhəmiyyətə malikdir. Yerli və beynəlxalq qurumlar və ölkələrin iqtisadi inkişaf istiqamətlərini müəyyənləşdirən məsul şəxslər iqtisadiyyatın inkişafı və sosial bərabərliyin təmin edilməsinə nail olmaq üçün müasir peşə təhsili sisteminin bərqərar olmasına xüsusi önəm verirlər... Dörd mühüm qlobal trend iqtisadi məhsuldarlığın amili kimi peşə təhsili və təliminin əhəmiyyətini artırır: qloballaşma, qlobal iqtisadi mühit, məhsuldarlıq tələbləri və məşğulluq üçün təhsilə diqqətin artması... Səriştəli işçi qüvvəsinə olan tələbatı ödəmək üçün bir çox dünya ölkələri peşə təhsilinin inkişafı və işsizliyin azaldılması istiqamətində müvafiq hüquqi və iqtisadi islahatlar həyata keçirirlər. Peşə təhsili sahəsində həyata keçirilən islahatlar sabahın işçi qüvvəsinin kiçik və orta sahibkarlığın üstünlük təşkil etdiyi dəyişən və rəqabətli əmək bazarının tələblərinə uyğun səviyyədə hazırlanması məqsədi daşıyır... Qlobal trendə görə, təhsilini ali məktəbdə davam etdirmək

istəyən şagirdlər orta məktəbi peşə-ixtisas təhsili sənədi ilə bitirməyə üstünlük verirlər. Bu halda onlar orta məktəb attestatı ilə yanaşı, əlavə bir peşəyə də yiyələnmiş olurlar və arzu etdikləri sahəni daha dərindən mənimsəyirlər" [3].

Əvvəla peşə məktəbi şagirdlərin düşüncə mədəniyyətini formalaşdıran, onlara yaradıcı olmaq, yaradıcılıq nümunələrinə həssas yanaşmaq, həyatın iqtisadi amillərini dəyərləndirə bilmək bacarıqları verməlidir. İkinci, peşə məktəbi bilik cəmiyyətinin ehtiyac və tələbatları qarşısında özünün vəzifələrini aydın və konkret müəyyənləşdirməklə, məzmun komponentinin, eləcə də təlim prosesinin qurulmasında ona aparıcı tələb kimi yanaşır. Son nəticədə müasir həyatın sosial-iqtisadi tələbatlarından irəli gələn insan amili üçün vacib səriştələri müəyyənləşdirməklə onun məzmunca yeniləşməsini təmin edir. Üçüncü, peşə təhsilində keyfiyyətinin yüksəldilməsi onun daha yaxşı, səriştəli qurulmasından bilavasitə asılı olduğunda həm müəllimlərin yeni qaydalarla işə qəbul olunması, onların diaqnostik qiymətləndirilməsi və bunun nəticəsində stimullaşdırılması, həm də məktəb rəhbərlərinin təlim kurslarından keçməsinə və rəhbər vəzifələrə seçilməsinə hazırlığın görülməsi istiqamətində aparılan işlər təhsilin keyfiyyətinin yüksəldilməsi istiqamətində atılacaq ciddi niyyətlərdir və bu proses yol xəritəsində müəyyən olunmuş vəzifələr baxımından davam etməkdədir.

"Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda deyildiyi kimi "Azərbaycan Respublikasının inkişaf konsepsiyasına uyğun olaraq şəxsə hərtərəfli bilik və bacarıqların verilməsi məqsədi ilə təhsil sisteminin institusional əsasları, infrastrukturu və insan resursları inkişaf etdirilməlidir. Təhsilin inkişafı ölkədə əhalinin rifahının yaxşılaşması, həmçinin fərdin həyatının daha yüksək səviyyədə qurulması üçün zəmin yaradır. Təhsil insanlara texnologiyaları çevik mənimsəmək, əmək bazarında layiqli yer tutmaq və ömür boyu təhsil prosesinə qoşulmaq, sağlam həyat tərzi, ətraf mühitə münasibətdə düzgün mövqe seçmək imkanı verir" [1].

Strateji yol xəritəsində deyildiyi kimi, "Peşə təhsili və təlimi sektorunda müəyyən edilmiş prioritetlərin real ÜDM-ə təsirinin təxminən 6 milyon manat olacağına baxmayaraq, bu prioritetlər digər sektorların prioritetləri çərçivəsində 1 milyard manat məbləğində dolayı təsirin meydana çıxmasına səbəb olacaqdır. Belə ki, peşə təhsili və təlimi sektoru iqtisadiyyatın digər sektorları ilə qarşılıqlı əlaqədə olmaqla, həmin sektorların potensialının tam reallaşdırılmasında mühüm rol oynayır və bu sektora qoyulan investisiyalar nəticədə iqtisadiyyata multiplikativ təsir göstərir" [3].

Məlumdur ki, Peşə təhsili rəqabətqabiliyyətli iqtisadiyyatın və inkişaf etmiş cəmiyyətin təşəkkül tapmasında böyük əhəmiyyətə malikdir. Dörd mühüm qlobal trend iqtisadi məhsuldarlığın amili kimi peşə təhsili və təliminin əhəmiyyətini artırır: qloballaşma, qlobal iqtisadi mühit, məhsuldarlıq tələbləri və məşğulluq üçün təhsilə diqqətin artması.

Qloballaşma ölkələr arasındakı əlaqələri genişləndirir və bunun nəticəsi olaraq təhsil sistemlərinin fəaliyyət və effektivliyinin müqayisəsinə maraq artır. İkincisi, qlobal iqtisadi mühit fundamental iqtisadi bacarıqlara diqqəti artırmışdır. Üçüncü iqtisadi qeyri-müəyyənlik və yeni bazarlara çıxış imkanı uğrunda artan rəqabət məhsuldarlıq

tələblərinin artmasına səbəb olmuşdur. Buna müvafiq olaraq, dünya ölkələri bazarların, şirkətlərin və fərdlərin əmək məhsuldarlığının artırılmasına getdikcə daha çox diqqət yetirirlər.

Dördüncüsü, getdikcə artan ixtisaslı kadr çatışmazlığı problemini həll etmək, tələbələrin və işəgötürənlərin ehtiyaclarını təmin etmək məqsədilə təhsilə maraq daha da artmaqdadır.

Səriştəli işçi qüvvəsinə olan tələbatı ödəmək üçün bir çox dünya ölkələri peşə təhsilinin inkişafı və işsizliyin azaldılması istiqamətində müvafiq hüquqi və iqtisadi islahatlar həyata keçirirlər ki, Azərbaycan da bu sahədə mövcud vəziyyət diqqətlə öyrənilir. Ölkəmizdə ilk peşə ixtisas təhsili sahəsində görülən işlər bu baxımdan örnək ola bilər.

Əvvəla Azərbaycan Respublikasında bütün sahələrdə olduğu kimi təhsil sahəsində də həyata keçirilən islahatların ardıcıl və fasiləsiz təminatına xüsusi diqqət yetirilir.

Bir tərəfdən təhsilin bütün pillələri üzrə hüquqi-normativ və qanunvericilik bazası təmin edilir, digər tərəfdən təhsilin tədris-metodiki, nəzəri-sosial əsasları möhkəmləndirməklə pedaqoji peşəkarlığın təminatında yeni meyarlara istinad edən strateji layihələr həyata keçirilir.

Ölkə Prezidentinin Fərmanı ilə təsdiq olunmuş "Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi" tamamilə zamanında qəbul olunmuş, dövlətin əvvəlki hüquqi aktlarını tamamlayan və ölkəmizin iqtisadi inkişafının perspektivlərini müəyyən edən konseptual sənəddir. Strateji yol xəritəsində 11 strateji hədəf içərisində Peşə təhsili və təliminin inkişafının da nəzərdə tutulması bu sahənin gələcək inkişafına çox ciddi stimul verməkdədir. "Azərbaycan Respublikasında peşə təhsili və təliminin inkişafına dair Strateji Yol Xəritəsi" 9 başlığı əhatə edir.

1-7 başlıqlar icmal xülasədən, peşə təhsili və təliminə dair qlobal trendlərdən və mövcud vəziyyətin təhlilindən ibarətdir. Qlobal trendlər aşağıdakı kimi müəyyən edilir: birinci qloballaşma, ikinci qlobal iqtisadi mühit, üçüncü məhsuldarlıq tələbləri və dördüncü məşğulluq üçün təhsilə diqqətin artması".

Burada həmçinin 2020-ci ilədək, 2020-2025-ci illər arası və 2025-ci ildən sonrakı dövr üçün strateji baxışlar, 8 istiqaməti əhatə edən Hədəf indikatorları və 11 alt məqsədi əhatə edən strateji məqsədlər verilmişdir.

İlk 7 istiqamətin 5-ni təşkil edən hədəf indikatorları ilə bağlı aşağıdakı fikrə diqqət yetirsək:

- peşə təhsili və təlimi sektorunda həyata keçiriləcək prioritetlərin 2020-ci ildə real ÜDM-ə birbaşa təsirinin təxminən 6 milyon manat, digər sektorların prioritetləri çərçivəsində dolayı təsirinin isə 1 milyard manat həcmində olacağı hədəflənir.

- sənəddə birincisi, Peşə təhsili və təlimi sektorunda 2020-ci ilədək strateji baxış da qeyd edilir ki, ölkədə əmək bazarının tələblərinə cavab verən mühəndis-pedaqoji heyətə, yenilənmiş təhsil proqramlarına (kurikulumlara) və peşə standartlarına malik pilot və optimallaşdırılmış peşə təhsili müəssisələrindən ibarət peşə təhsili və təlimi sisteminin formalaşdırılmasıdır.

- ikincisi, 2020-2025-ci ilədək uzun müddətli dövr üçün strateji baxışda göstərilir: Azərbaycanda peşə təhsili və təlimi sektoru üzrə 2025-ci ilədək olan dövr üçün uzunmüddətli baxış əmək bazarının tələblərinə cavab verən peşə standartları və təhsil proqramları (kurikulumlar) əsasında

ixtisaslı işçi qüvvəsi hazırlayan, hər bir sektor üzrə işəgötürənlərlə sıx əməkdaşlıq əlaqələrinin qurulduğu, funksional peşə təhsili və təlimi müəssisələrinə malik peşə təhsili sisteminin formalaşdırılmasıdır.

- Nəhayət, 2025-ci ildən sonrakı dövr üçün hədəf baxışlarda isə göstərilir: Peşə təhsili və təlimi sistemi üzrə 2025-ci ildən sonrakı dövr üçün hədəf baxış potensial istedadlı gəncləri aşkarlayaraq cəlb edən, prioritet sektorları innovativ və yüksək əmək məhsuldarlığına malik işçi qüvvəsi ilə təmin edən və beynəlxalq səviyyədə tanınan rəqabətqabiliyyətli sistemin qurulmasıdır.

8-11-ci istiqamətlər isə 10 alt mənbəni əhatə edən maliyyələşmədən, 9-cu isə icra, monitorinq və qiymətləndirmə kimi vacib təhsil elementlərinin modernləşməsindən ibarətdir.

Strateji Yol Xəritəsinin sonunda verilmiş Tədbirlər planı isə hərəkətin dəqiq mərhələlər üzrə icmalıdır ki, bizlər bunu daim öyrənməli, tətbiq etməli və nəzarətdə saxlamalıyıq.

İlk Peşə ixtisas təhsili ilə bağlı ən mühüm məslələrdən biri də “Peşə təhsili haqqında” indiyədək ayrıca, müfəssəl qanunun olmamamasıdır. Bu yaxınlarda Milli Məclisin müzakirəsinə təqdim edilmiş Qanun layihəsində mütləq peşə təhsilinin tiplərinə diqqət yetirilməli, “Təhsil haqqında” Azərbaycan Respublikasının Qanunun 14-cü maddəsi peşə təhsilində də gözlənilməlidir.

***Rəyçi*: prof. H.Əhmədov**

## İstifadə edilmiş ədəbiyyat


1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. http://www.president.az/articles/9779.
2. Azərbaycan Respublikasının Təhsil Nazirliyi yanında Peşə Təhsili üzrə Dövlət Agentliyinin Əsasnaməsi. http://edu.gov.az/az/page/354/12337.
3. Azərbaycan Respublikasında peşə təhsili və təliminin inkişafına dair Strateji Yol Xəritəsi. http://edu.gov.az/upload/file/serencama-elave/2016/peshe-tehsil-yol-xeritesi.pdf.
4. Əhmədov H. “XIX əsr Azərbaycan məktəbi”. Bakı: ABU, 2005, 580 s.
5. Əhmədov H.H Azərbaycan təhsilinin inkişaf strategiyası. Bakı: Elm və təhsil, 2010, 800 s.
6. Əsgərov R., Qurbanov M. İlk peşə-ixtisas təhsili: problemlər və perspektivlər. Bakı: “ŞAHİN-MB” MMC, 2016, 250 s.
7. Mərdanov M. Azərbaycan təhsil tarixi. Bakı: Təhsil nəşriyyatı. 2011. 295 s
8. "Təhsil haqqında" Azərbaycan Respublikasının Qanunu. http://edu.gov.az /az/page/72/302.
9. Бикмухаметов И. Инновационные направления модернизации профессионального образования. – 2010. [Электронный ресурс] URL: http://www.uecs.ru/logistika/item/240-2011-03-24-12-33-05.
10. Волков А., Реморенко И. Доклад «Российское образование 2020: модель образования для экономики, основанной на знаниях». [Электронный ресурс] URL:http://www.amur-iro.ru/upload/doklad_2020.doc.
11. Закарьяева З. Управление современным образованием: организационные механизмы / З. Закарьяева // Философия

хозяйства. – 2011. – № 2 (74). – С. 161–166.

12. История профессионального образования [Электронный ресурс] // МГИУ: [Электронный ресурс]. – 2011. – URL: http://www.vfmgiu.ru/Higher-education-in-Russia/istoriya _professionalnogo_obrazovania_442/index.html.

13 Приоритеты профессионального образования // Высшее образование сегодня. – 2010. – № 9. – С. 7–13.

14. Проектирование основных образовательных программ вуза при реализации уровневой подготовки кадров на основе федеральных государственных образовательных стандартов / Под ред. С. В. Коршунова. – М.: МИПК МГТУ им. Н. Э. Баумана, 2010. – 212 с.

**Г.Байрамов**

**Начальное специальное профессиональное образование: становление и перспективы развития**

**Резюме**

В статье рассматриваются исторические этапы становления профессионального образования, также дается оценка роли социально-экономических условий в развитии профессионального образования, говорится о дальнейших перспективах указанной отрасли. Основываясь на главных приоритетах образовательной политики, проводимой государством в этой сфере, создается целостная научно-практическая панорама професионального образования в стране.

**H.Bayramov**

**İnital special vocational education: formation and prospects of development**

**Summary**

The article deals with the historical stages of the formation of vocational education. In the article the role of social and economic conditions in the development of vocational education is also assessed, and the future prospects of this sector are discussed. Basing on the main priorities of the educational policy, conducted by the state in this sphere, an integral scientific and practical panorama of professional education in the country is presented.

***Dilimiz-milli varlığımız***



# NİTQ MƏDƏNİYYƏTİ VƏ NATİQLİK SƏNƏTİ FƏNNİNDƏ MİRZƏ ƏLƏKBƏR SABİR KURSU



**Vaqif Qurbanov,**
*ADPU-nun əməkdaşı*

**Xaqani İbrahimov,**
*Kəlbəcər RTŞ-nin metodisti*

**Mədəniyyəti yüksək olan xalq həmişə inkişaf edəcək, həmişə irəli gedəcək!**
**Heydər Əliyev**

Məlumdur ki, belə bir fənn daxilində bu adda kursun filoloji fakültələrdə daha mükəmməl tədris olunması M.Ə Sabirin 20-yə qədər uşaq şeirini, dərin məzmunlu və tarixi əhəmiyyət kəsb edən, habelə bu günümüzlə səsləşən əsərlərini tələbələri sevindirmək ixtisasa hazırlıq baxımından çox əhəmiyyətlidir. Bununla belə, cari ildə bu fənn üzrə imtahanların yazılı deyil, şifahi keçirilməsi, fənnin tədrisinin praktik istiqamətinin gücləndiriməsi, dərslərin seminar-praktikum formasında keçirilməsi yaxşı perspektiv vəd edir.

Müzakirə tərzi ilə yazılmış bu məqalədə belə məsələlərdən söhbət açılır.

***Açar sözlər:*** *ixtisasa hazırlıq, ibtidai təhsil, uşaq şeirləri, satirik əsərlər, mütaliə, ifadəli oxu, bədii təfəkkür, ədəbi-bədii incilər, M.Ə. Sabir kursu, şeirin əzbərlənməsi, təqdim etmə, mükəmməl.*

***Ключевые слова:*** *подготовка к специальности, начальное образование, детские стихи, сатирические произведения, чтение, выразительное чтение, литературное мышление, художественно – литературные шедевры, курс М. А. Сабира, выучивание стихов, презентация, совершенный.*

***Key words:*** *specialty preparation, primary school education, nursery poems, satirical works, reading, peroration, fictional thinking, literal-fictional gems, M.A.Sabir course, memorization of poem, presentation, perfect..*

Ümummilli liderimiz Heydər Əliyevin bir nəsihəti də belə idi: Nitq mədəniyyəti bütün məktəblərdə tədris olunmalıdır, mükəmməl öyrənilməlidir; uşaqlar, gənclər, yaşlı insanlar kimlərin nitqi nümunəsində bu dilə yiyələndiklərini bilməlidirlər. Ədəbi dilimizin normaları var, bu normalarda danışmaq və yazmaq insanın mədəni göstəricisi sayılır...

Müdrikcəsinə deyilmiş bu kəlamların müəllifi, o böyük azərbaycanlı nitq mədəniyyətinə yiyələnməyə həm də Azərbaycan dilinin, tarixinin, coğrafiyasının, eyni zamanda azərbaycanşünaslığın, dünyaşünaslığın öyrənilməsini kimi baxırdı.

Gənc nəsli Azərbaycan dilində kamil

nitqə yiyələndirmək Azərbaycan məktəbinin əzəli vəzifəsidir. Təəssüf ki, bu sahədə hələ də problemlər var. Əvvələr, “Nitq mədəniyyəti və natiqlik sənəti” fənni filologiya fakültələrində tədris olunardı. Hazırda neçə illərdir ki, ümummilli liderin göstərişlərindən sonra, demək olar ki, bütün fakültələrdə tədris planına daxil edilmişdir. Lakin problematikdir.

Deməli, nəticələr var, ancaq nəticələrlə yanaşı, problemlər də var. Onlar hansılardır?

1. Klassiklərimizin söz, söz mədəniyyəti nitq, natiqlik haqqındakı fikrlərini tələbələrə mənimsədə bilirikmi?

Əvvəla nitq mədəniyyəti və natiqlik sənətinin aktual problemlərindən danışanda bu sualdan yan keçmək olmur. Misal üçün, götürək elə M.Ə.Sabiri sözdən, nitqdən, natiqlikdən söz açmış, bədii obrazlar yaratmışdır. Şairin öz dövründə ən məşhur natiqlərin ən parlaq siması kimi Təqizadəni fəxr-fəxarətlə tərənnüm etmişdir. Bu da onu göstərir ki, Sabir özü həm nəzəriyyə düşüncəli və həm də M.Ş.Vazeh, M.F.Axundov, A. Bakıxanov sırasında layiqli yer tutan təcrübi məharət səviyyəli şair-natiq olmuşdur. “Hophopnamə”də “Söz” və “Nitqə xitab” şeirlərinin məzmun təhlili, habelə Təqizadə kimi insanların nitqlərinin İran məclisini təlatümə salmasından bəhs etməsi onu bir daha sübut edir ki, M.Ə.Sabir həm dahi söz ustadı sayılaraq öyrənilməyə layiqdir. Lakin bu işdə problem orasındadır ki, M.Ə. Sabirin əsərləri nəinki şairin yaradıcılığı kimi, hətta uşaq şeirləri kimi də dərsliklərə, proqramlara lazımınca daxil edilmir.

Keçmiş dönəmdə M.Ə.Sabir orta məktəbdə ən şox öyrənilən şairlərimizdən olmuşdur. Şairin 20 uşaq şeirinin əksəriyyəti ibtidai sinif ana dili dərsliklərində tədris olunardı. “Məktəbə çağırış”, “Uşaq və buz”, “Gəl, gəl a yaz günləri”, “Cütcü”, “Əkinçi”, “Nə işim var”, “Fəhlə”, “Bakı fəhlələrinə”, “Oxutmuram, əl çəkin”, “Satıram”, “Qarğa və tülkü” və s. nəinki uşaqların, hətta böyüklərin də dilinin əzbəri olardı və hətta ayrı-ayrı parçalar məsəllərə çevrilərdi. İndi bunlar yalnız yaşlı nəslin danışığında qalıb. Bəs belə bir dahini diqqətdən kənarda saxlamaq biganəlik deyilmi?

Onun elə satiraları var ki, oxuyursan, gülürsən, görürsən ki, əslində sən özünə gülürsən və düşünürsən ki, bu deyilənlər bizim bu günümüzə də aid imiş. Bizi ayıltmaqdan ötrü imiş. Ancaq 100 ildən çox vaxt keçib, bəzi məsələlərdə hələ də ayılmamışıq.

Bimərhəmət insanlarına şükr, xudaya!
Bu sahibi-milyanlarına şükr, xudaya!
... Heç nə bilməyən yeyib-içməkdən əlavə,
Bu canlı dəyirmanlarına şükr, xudaya!
... Qurd isə, şəqal isə biyabanda olurdu,
Şəhr içrə bu heyvanlarına şükr, xudaya!
(1, 140).

M.Ə.Sabir dövründən çox şey dəyişib. Millətin tör-töküntülərində heç nə dəyişməyib, Niyə? Onlar ki, məktəb görüblər, təhsil görüblər. 100 il qabaq da qadın hamamlarına dəstə ilə hücum etmişlər, indi də qadın xanəndələrin evlərini yağmalayırlar. İndiki qəhrəmanların bu ifadədən xəbərləri olsaydı, bəlkə də, əl saxlayardılar.

Həmmamdə övrətlərə quldurluq edən bu
Qeyrətli müsəlmanlarına şükr, xudaya!
(1, 140).

Görürsünüz, M.Ə.Sabirin satira qəhrə-

manları sağdırlar. Hələ də cəhl-cəhalət qiyafəsində gəzənlərin milli birliyə, həmrəyliyə gəlmək istəməyənlərin tərbiyə edilməsində Sabir satirasının yerini yalnız Şeyx Sədi, Şeyx Nizami nəsihətçiliyi ilə dəyişə bilmərik. Bizə Sabir satiraları bu gün hava və su kimi lazımdır.

M.Ə.Sabirin əsərlərini Şərq və Azərbaycan tarixi ilə, xüsusən də bu günümüzlə səsləşən ədəbi nümunələr kimi təhlil edib öyrətmək, XX əsrin mətbuatının qaldırdığı poblemlərə, toxunduğu məsələlərə verilən reaksiya kimi təhlil edib öyrənmək lazımdır.

"Səttarxana" şeiri milli azadlıq uğrunda mübarizə ilə əlaqədar əks-sədadır.

Bu şeiri ərəb-fars sözlərindən az istifadə olunan bəndlərini əzbərləmək və ya məruzə hazırlamaq yolu ilə öyrətmək olar.

Afərin Təbrizyan, etdiz əcəb əhdə vəfa,

Dost, düşmən əl çalıb eylər sizə səd mərhaba.

Çox yaşa, dövlətli sultanım, əfəndim, çox yaşa

Cənnəti-əladə peyğəmbər sizə eylər dua.

Çün bu xidmətlər bütün islamədir, insanədir,

Afərinim himməti-valayi-Səttarxanədir. [1, s. 73].

… "Səttərxana" şeirini deklomasiya eləyib meydana çıxarmaqla həm qəhrəmanlıq tariximizi unutmadığımızı, həm bugünkü Mübariz İbrahimov, Çingiz Qurbanov, Ramil Səfərov kimi qeyrətli insanlarımızın milli qeyrət, milli qürur, milli dirçəliş, milli təkamül yolu ilə getdiklərini bəyan etmiş oluruq.

M.Ə.Sabir əsərlərini yalnız ədəbiyyat tarixi kimi öyrənməkdə belə problemlər var, nəinki onun deyimlərini şüarlara çevirməkdə, şüarlar millətə irəli gedəcəyi, tapa biləcəyi düzgün yolu göstərmək üçündür.

M.Ə. Sabir əsərlərində gün kimi aydın ideya istiqaməti var. Onun elə bir kəlməsi yoxdur ki, bu gün üçün aktual səslənməsin. Misal üçün, "Dinim-imanımsan a pul", "adəmi adəm eyləyən parədir", "olmasaydı cahanda sarsaqlar, yəqin ki ac qalardı yaltaqlar", "tənbəl dəli şeytanları neylərdin ilahi", "qovzama başın cocuğum, səbr elə", "namus hər şeydən bəhadir, oğul" və s. kimi qiymətli ifadələr hikmət xəzinəsidir; bunlara necə biganə qalmaq olar?

M.Ə.Sabir vaxtilə cəhalət burulğanına elə atası sağlığında düşmüşdü. Atası onun şeir dəftərini cırıb-yandırmışdı. Gənc Sabir Şirvandan Babilə qaçmışdı, daha sonralar həmin əhvalatı belə xatırlamışdı:

Xəlilullah-e əsrəm mən, babam yurdunda Azərdir,

Çıxam Babilə Şirvandan gərək surətlə inşallah.

Atam şeir dəftərimi cırıb odda yandırdı,

Onu gövhər saçan təbimlə tikəm qüdrətlə, inşallah!

XX əsrin əvvəllərində müsəlman cəhalətinə qarşı Sabirin müasirləri "Molla Nəsrəddin"lə qiyam qaldırdılar. Bayraqdar M.Ə.Sabir idi. Onun nitqi daha iti, xəncər kimi daha kəsikindi. Şeirləri duzlu-məzəli məlahətli idi. Güldürürdü, ağladırdı, ayıldırdı. O dövrün mətbuatı Sabiri nəşr edirdi, bununla da milli özünüdərk hərəkatına qoşulurduq. Mirzə Cəlil rəhbərlik edirdi. M.Ə.Sabir nişançı paşa idi.

Sabirin "Satıram", "Şükr xudaya", "Səttarxana", "Fəxriyyə", Çığırma, yat", "Qorxuram", "Bəzi yerlərdə təsadüf olunur aşə, ətə", "Uşaq və pul" və s. kimi yüzlərcə

belə əsərlərinin, deklamasiyası imkan verir ki, orta və ali məktəblərdə filoloq tələbələrdən bədii söz ustaları yetişdirək.

Belə imkanları nəzərdən qaçırmaq olmaz. Azərbaycan xalqı durduqca M.Ə. Sabirin qaldırdığı problemlərə görə mübarizə aparmağa ehtiyac duyulacaq. Millətin dini, hüquqi, siyasi və mənəvi cəhətdən saflaşmasına, təkmilləşməsinə təkcə elə Sabir dövründə ciddi ehtiyac olmayıb; indinin özündə də var. Biz bilirik ki, M.Ə.Sabir Şərq dünyasının, islam aləminin şairidir. Onun xidməti “İslamədir, İnsanədir”. Cəhaləti İslam ölkələrindən, millətindən necə uzaqlaşdırmaq yolunu Sabir yaxşı bilirdi. Mükəmməl təhsil cəhl-cəhalətdən qurtarmağın ən rasional yoludur.

Köhnəliyi idealizə edənlər vardı. Özü də təkidlə. Odur ki, M.Ə. Sabir cəhli-təkidin insanları əbədi olaraq izləyəcəyini yaxşı duyub yazırdı:

Lənət sənə, ey cəhl nə bidad ediyorsan,

Hər gün yeni min mələnət icad ediyorsan.

Sərməşq edərək Habilü Qabil hərəkatın

Qardaşları qardaşlara cəllad ediyorsan.

Nakəslərə imdad, bikəslərə bidad,

Gör sən kimə yardım, kimə bidad ediyorsan? [2, s. 7].

Cəhlin biri bundan ibarətdir ki, “İstərəm örtməgi” şeirinin fars variantını bilib onu Saib Təbriziyə aid edənlər var (2, s. 7). Lakin həqiqət bundan ibarətdir ki, Saib Təbrizidə belə bir şeir yoxdur.

Həmin şeirin “Hophopnamə”də verilməsi və külliyyatın A.Səhhət tərəfindən tərtib olunması və şeirin məzmununun böyük şairin səhhətinin ağırlaşması, xəstəliyinin şiddətlənməsi ilə əlaqədar olması daha faktoloji məqam kimi inandırıcıdır.

İkinci cəhl 1929-cu ildə meydana gəlmişdir. “Nə işim var” şeirini, guya, Sabirə aid olmaması ilə əlaqədardır. Görkəmli M.Ə.Sabir tədqiqatçılarının başını dumanlandırdığı bu fikir də fiaskodan, başqa bir şey deyil.

Başqa cür, ayrı xarakterli cəhllər də var; biz onları yada salıb ürək bulandırmaq istəmirik. Bunlar M.Ə. Sabiri axıra qədər səbrlə oxumamaqdan, izahlara, tarixi komentarilərə, o dövrün mətbuatına əhəmiyyət verməməklə əlaqədardır.

Nəhayət, onu nəzərə alamq lazımdır ki, M.Ə.Sabir və Cəlil Məmmədquluzadə satira mərkəbi dərindən öyrənilməlidir. M.Ə. Sabir əsərlərinin ayrıca kurs kimi öyrəlməsinin zərurliyini şərtləndirən amillər var ki, bunlarda aşağdakılardır:

1. M.Ə.Sabirin əsərlərində müsəlman Şərqinin tarixi əks olunub; deməli, şairin yaradıcılıgı Şərq tarixidir. “Hophopnamə”nin izahat hissəsinə baxsaq, bu tarixin nə qədər həqiqət olduğuna inana bilərik.

2. M.Ə.Sabir satiraları islam xalqlarınn psixologiyasını açan psixologiya, etnopsixologiya didaktikasıdır.

3. M.Ə.Sabir satiraları tənqid və özünütənqidin fəlsəfi əsaslarıdır. Onları fəlsəfə kimi öyrənmək lazımdır.

4. M.Ə.Sabir əsərləri etnopedaqogika külliyatıdır. O da Nəsirəddin Tusi pedaqogikası kimi tərbiyə edir, ancaq satira üslubu ilə.

5. “Hophopnamə”nin ensiklopedik lüğəti sirlər xəzinəsidir.

Mirzə Cəlillə Mirzə Ələkbər Sabirin,

yəni bu iki demokratın milli oyanış, milli özünüdərk sahəsində əməyini yüksək qiymətləndirmək üçün tədqiqatlara, yeni aspektdən yanaşmaq lazımdr. Yalnız o zaman biz belə bir ümumiləşdirici nəticələrə gələ bilərik:

Mükəmməl təhsil cəhl-cəhalətdən qurtarmağın yeganə rasional yoludur.

***Rəyçi: prof. N.Abdullayev***

## İstifadə edilmiş ədəbiyyat


1. Hophopnamə (2 cilddə I cild). Bakı: Şərq-Qərb, 2004, 478 s.
2. Hophopnamə (2 cilddə II cild). Bakı: Şərq-Qərb, 2004, 478 s.
3. Dil mədəniyyəti. Bakı: Elm (IV buraxılış), 1985. 168 s.


**В.Гурбанов,**
**Х.Ибрагимов**

**Курс М. А. Сабира по предмету «Культура речи и ораторское искусство**

**Резюме**

Известно, что более совершенное преподавание курса под этим названием внутри такого предмета на филологических факультетах и факультетах, дающих специальность учителя начальных классов, имеет большое значение с точки зрения подготовки к специальности, присвоения студентов до 20 детских стихов М. А. Сабира, произведений, имеющих глубокое содержание и историческое значение, а также произведений, актуальных и в сегодняшний день.

Тем не менее, в текущем году не письменное, а устное проведение экзаменов по данному предмету, усиление практического направления преподавания этого предмета, т.е. проведение уроков в форме семинара – практикума обещает хорошие перспективы.

В данной статье, написанной в форме обсуждения, рассказывается о таких вопросах.

**V.Gurbanov,**
**Kh.İbrahimov**

**M.A.Sabir course on “Speech culture and speech art” subject**

**Summary**

It’s known that more perfect teaching of this course in such a subject in philological faculties and faculties specialized in primary school teacher is very important for specialty preparation in learning of students 20 nursery poems by M.A.Sabir, the works which have deep context, historical importance and the same tone with modern world.

In addition to this, taking exam on this subject in current year not written, but in oral form, strengthening of practical orientation of this subject, i.e. conducting lessons in seminar-practicum form gives hope about good perspective.

This article written in discussion form deals with such matters.



# NİTQ FƏALİYYƏTİ ZƏMİNİNDƏ TƏDRİSDƏ DİNLƏMƏ MƏTNLƏRİ MÜHÜM KOMPONENT KİMİ

**Nərgiz Ramizzadə,**
***Azərbaycan Dövlət Pedaqoji Universitetinin doktorantı***

***Açar sözlər:*** *dil təlimi, dinləmə mətni, dinləmə bacarığı, nitq fəaliyyəti.*
***Ключевые слова:*** *язык обучения, развитие пути, текст прослушивание, речевая деятельность.*
***Key words:*** *language training, listening  text, listening skills, speech activity.*

Azərbaycan təhsili özünün yeni inkişaf mərhəsini yaşayır. Bugünkü təhsilimizin qarşısında duran başlıca məqsəd müasir tələblərlə ayaqlaşan, gələcəyə yönlük insan, şəxsiyyət yetişdirməkdir. Keçən əsrin sonundan bugünə kimi təhsil sahəsində baş verən dəyişikliklərə nəzər salsaq bu problem öncül yerlərdən birini tutur. Əlbəttə ki, bu yeniliklərdən ən əsası respublikamızın, ümumtəhsil məktəblərində yeni kurikulumun tətbiq olunmasıdır. Artıq X siniflərdə də kurikulumlar tətbiq olunmaqdadır.

Kurikulumun tətbiqi ilə təhsilimizin məzmunu, fəlsəfəsi tamamilə yeniləşdirilmişdir. Bu yeniləşmə işinə mədəniyyət də aiddir. Bu məsələyə də dünya təhsilində baş verən qloballaşma baxımından yanaşılmışdır. Təhsilin konsepsiyasının dəyişdirilməsi ilə əlaqədar yeni məzmun xətləri - strateji məqsədlər müəyyənləşdirildi. Onların əsasında hər bir sinif üçün məzmun standartları təsbit olundu. Başqa sözlə, Milli Kurikulumun yaranması onun standartlarının təhsilə daxil olması o qədər də rahat baş verməmişdir.

Bu yolda hər şey məzmun standartlarının tərtibinə də başlandı. Taktiki məsələlər - standartların tədrisdə reallaşdırılması yolları dərslik müəlliflərinin və müəllimlərin öhdəsinə buraxıldı. Standartların mahiyyətini dərk etmək, onlara uyğun çalışma modelləri düşünüb tapmaq, hər bir dərsin təlim məqsədini müvafiq standartla və bütün bunları müasir təlim texnologiyaları ilə uzlaşdırmaq o qədər də asan məsələ olmamışdır. Odur ki, hazırda da, bəzi müəllimlər bu və ya digər çalışmanın hansı standarta xidmət etdiyini müəyyənləşdirməkdə çətinlik çəkirlər. Çünki məqsədi aydınlaşdırmadan göstərilən fəaliyyət səmərəli nəticə verə bilməz.

İnformasiya qəbul etmək və informasiya ötürmək prosesi yazılı və şifahi yolla baş verir. Dinləməklə və oxumaqla informasiya alınır, danışmaqla və yazmaqla informasiya ötürülür. Beləliklə, ünsiyyət prosesində dörd nitq bacarığından istifadə olunur: dinləmə, danışma, oxu, yazı.

Milli Kurikulumun qaynaqlandığı Qərb yanaşmasında dilin tədrisi bu dörd dirək üzərində qurulub. Bu yanaşmaya görə, sözügedən dörd bacarıq sadəcə dil fənninə aid olan komponentlər deyil, metabacarıqlardır, yəni elmin və praktikanın bütün sahələrində istifadə olunan vasitələrdir. Təsadüfi deyil ki, ABŞ və Avropa universitetlərinin bir çoxu əcnəbiləri TOEFL və IELTS imtahanlarının nəticələri əsasında qəbul edir. Bu imtahanlar məhz nitq bacarıqlarının yoxlanması üzərində qurulur. Qəliz elmi-kütləvi mətni oxuyub qavradığını nümayiş etdirmək, səlis və maraqlı danışmaq, ədəbi dilin normalarına uyğun yazmaq, dinlədiyini təfərrüatı ilə anlamaq və öz fikrini bildirmək - bütün bunlar intellekt göstəriciləridir. Qərb pedaqoqları belə hesab edirlər ki, bu dörd bacarığa yüksək səviyyədə yiyələnmiş hər bir şəxs elmin istənilən sahəsində uğur qazana bilər.

Oxu- Hər bir şəxsin intellekti, ilk növbədə, onun oxu bacarığı əsasında qiymətləndirilir. İllər boyu bizdə oxu bacarığı dedikdə, oxu texnikasının səviyyəsi nəzərdə tutulub. Düşünürdük ki, əgər şagird səlis oxuya bilirsə, deməli, oxu bacarığına yiyələnib. Oxuyub qavrama bacarığını yoxlama texnologiyası isə milli təhsilimizdə çox zəif olub. Ən yaxşı halda verilmiş mətndən hər hansı nəqli cümlə çıxarılıb, sual cümləsi şəklində tapşırıq kimi qoyulurdu.

Müasir metodika oxuyub anlamanı inkişaf etdirmək və yoxlamaq üçün çoxlu miqdarda rəngarəng çalışma modelləri təqdim edir: mətndən çıxarılmış cümlənin (abzasın) mətndəki yerini tapmaq, qeyri-ardıcıl verilmiş mətnin ardıcıllığını bərpa etmək, mətndəki hadisələrin səbəb-nəticə əlaqələrini müəyyən etmək, mətnə və onun hissələrinə başlıq vermək, mətndəki elmi məlumatları qrafik informasiya şəklində təqdim etmək və s. Onlarla belə model var ki, şagirdin tənqidi, analitik, yaradıcı təfəkkürünü formalaşdırır. Düşünülmüş metodika üzərində qurulan mütaliə insanın dünyagörüşünü genişləndirir, söz ehtiyatını zənginləşdirir, nitq mədəniyyətini inkişaf etdirir.

Dinləmə-Elm və texnikanın inkişaf etdiyi, audiokitab və dərsliklərin geniş yayıldığı bir dövrdə biz çox vaxt məlumatları səsli informasiya şəklində qəbul etməli oluruq. Ali məktəbdə mühazirələrə qulaq asır, diskussiya və debatlarda opponenti dinləyib ona münasibət bildiririk. Odur ki, dinləyib anlama bacarığının həyatımızda rolu getdikcə artır.

Oxu kimi, dinləmənin də məqsədi informasiya qəbul etmək, anlamaqdır. Lakin oxu ilə müqayisədə dinləmə çox yüksək səviyyədə diqqətcillik tələb edir. Burada informasiyanın anlaşılmaz hissəsinə dəfələrlə qayıtmaq imkanı yoxdur. Mətni bir dəfə dinlədikdən sonra ona adekvat reaksiya vermək lazım gəlir.

Nitq - ən mühüm ünsiyyət vasitəsi olmaqla dilin yazılı və şifahi təzahür formasını özündə əks etdirir (6,265). Hər bir xalqın milli mədəniyyətinin göstəricilərindən biri də gözəl nitqdir. Nitq şəxsin müəyyən kollektivin digər üzvləri ilə qarşılıqlı əlaqə saxlamaq məqsədilə dildən istifadə etmək fəaliyyətidir. Nitqin əsas məqsədi informasiya mübadiləsi yaratmaqla informasiyanın ötürülməsi, qəbul edilməsidir. Lakin bununla yanaşı, nitq informasiyanın qeydə alınması və saxlanması məqsədinə də xidmət edir. Dil ünsiyyət vasitəsi olmaqla özünəməxsus qrammatik quruluşu və ifadə imkanlarına malikdir. Nitq isə ünsiyyət prosesi olmaqla dilin ifadə imkanları əsasında hər hansı bir

məlumatın verilməsi şəklində ortaya çıxır. Haqlı olaraq bir çox araşdırmaçıların əsərlərində bu fikir səslənmişdir: "Dil əsasdır, nitq ondan törəmədir". Həqiqətən də nitq - insanların dil vasitəsilə həyata keçirdiyi bir prosesdir. Əgər dil olmasaydı, nitq prosesi yaranmazdı. Buna misal olaraq iki lal şəxsin ünsiyyət prosesini misal göstərmək olar. “Nitq fəaliyyəti - nitqin ortaya çıxması üçün lazım olan ictimai, psixoloji və fizioloji proseslərin toplusudur” (4,125). Dil və nitq eyni hadisənin yəni nitq fəaliyyətinin bir-biri ilə qarşılıqlı əlaqədə olan iki cəhətidir. Nitqin aydınlığı və təsirli ola bilməsi üçün dil, öz növbəsində dilin mövcudluğu üçün nitq zəruridir. Hər hansı dilin sitemini yalnız nitqdəki təzahürünə görə müəyyənləşdirmək olur. İstər ibtidai siniflərdə, istər də yuxarı siniflər üçün Azərbaycan dili dərsliklərində verilən dinləmə mətnləri üzrə çalışmalar bu aspektdən çox əlverişli rol oynayır. Bu mətnlər vasitəsilə dilin rolunu və əhəmiyyətini, ünsiyyət vasitəsi olaraq dilin funksiyalarını dərk etmək, söz, cümlə və mətn səviyyəsində dil və məna əlaqəsini anlamaq, dinləmə, danışma, oxuma və yazma fəaliyyətlərində Azərbaycan dilinin yazı qaydalarına, danışıq xüsusiyyətlərinə və incəliklərinə diqqət göstərməsini təmin etmək və s. mümkündür.

Nitq nəinki dili təzahür etdirir, həm də onu inkişaf etdirir, formalaşdırır. Əgər dil ünsiyyət vasitəsidirsə, nitq ünsiyyətin özüdür. İxtisasıdan asılı olmayaraq hər bir mütəxəssis gələcəkdə insanlarla ünsiyyətdə olacaqdır və öz nitqindən onlara təsir vasitəsi kimi istifadə edəcəkdir. Əslində bu yöndə tələb eynidir: tələbələr öz fikir və düşüncələrini həm yazılı, həm də şifahi formada ifadə etməyi, mühakimə yürütməyi, həmkarları qarşısında öz mövqelərini, baxışların ıifadə etməyi bacarmalıdır. Yalnız bu üsulla onlar təcrübə qazana, mütəxəssis kimi yetişə biləcəkər.

İbtidai siniflərdə Azərbaycan dili təliminin qarşısında duran ümumi və konkret didaktik vəzifələr şagirdlərin dünayagörüşünün və təfəkkürünün inkişafına və ən başlıcası nitq bacarıqlarının və nitq mədəniyyətinin inkişafına xidmət edir. Müasir Azərbaycan ədəbi dil normalarının (fonetik, orfoqrafik, orfoepik, leksik, semantik, qrammatik, üslubi) ibtidai siniflərdə təcrübi, praktik yolla mənimsənilməsi zəruri olmaqla, gələcəkdə şagirdlərin kamil nitqə yiyələnməsini təmin edir. Kamil nitqi xarakterizə edən əsas amillər: nitqin ayıdınlığı, obrazlılığı, yığcamlığı, təmizilyi, düzgünlüyü, zənginiliyi, sadəliyi, münasibliyi, rabitəliliyi, ifadəliliyi, dəqiqliyi, məntiqiliyi, konkretliyi, səlisliyi və ahəngdarlığı, səmimiliyinə dair bacarıqların özülü ibtidai siniflərdə qoyulur. Bu baxımdan dinləmə mətnləri üzərində çalışmaların rolu əvəzsizdir. Bu çalışmalar vasitəsilə şagirdlər dinlədiklərini və oxuduqlarını doğru araşdırma və anlama bacarığı qazanmaqla, dinlədiklərini, oxuduqlarını, anladıqlarını, düşündüklərini söz və yazıyla planlı, təsirli, axıcı, aydın şəkildə ifadə edir, Azərbaycan dilinin qayda qanunlarını doğru və gözəl istifadə emək bacarığı qazanırlar.

Hazırda şagirdlər I sinifdən etibarən Azərbaycan dilinin zənginliyi ilə tanış olmağa başlayır, yuxarı siniflərdə azərbaycan dilinin nəzəri və praktik cəhətdən daha dərindən öyrənirlər. I sinifdə savad təlimi dövründən şagirdlər nitq səslərini öyrənməklə, onların qrafik işarəsi olan hərfləri tanıyır, oxu və yazı texnikasına yiyələnirlər. Səs və hərfin fərqi fonunda

onlar həm də ilkin fonetik biliklər əldə edirlər.

Savad təlimi dövründə aşağıdakı məsələlər diqqət mərkəzində saxlanılır:

- Savad təlimi dövrünün məqsəd və vəzifələri;
- Savad təlimi dövründə dərslərin təşkili və quruluşu;
- Savad təlimi dövründə fəal (interaktiv) təlim metodlarından istifadə;
- Savad təlimi dövründə istifadə olunan əyani və texniki vasitələr;
- Savad təlimi dövründə nitq və təfəkkürün inkişafı (3, 65).

Savad təlimi dövründə şagirdlər ilkin oxu və yazı bacarıqlarına yiyələnirlər. İlkin mərhələdən şagirdlərin ədəbi dil normalarına uyğun oxu və yazıya yiyələnməsi diqqət mərkəzində saxlanılır. Bu baxımdan strategiyalı oxu vərdişlərinin yaradılması istiqamətində işlərin təşkili qaydaları dərslikdə geniş şəkildə öz əksini tapmışdır.

Azərbaycan dilinin tədrisi metodikası elminin məqsədi ibtidai siniflərdə Azərbaycan dili təliminin məzmununu müəyyənləşdirmək, öyrənilən bilik, bacarıq və vərdişlərin formalaşdırılmasının metodik sistemini hazırlamaq, şagirdlərdə nitq bacarıqlarını, nitq mədəniyyətini inkişaf etdirməkdən ibarətdir.

Azərbaycan dilinin tədrisində son məqsəd şagirdlərin şifahi və yazılı nitq bacarıqlarını inkişaf etdirməklə, onların nitq mədəniyyətinə yiyələnməsindən ibarətdir. Şagirdlər öz fikirlərini Azərbaycan dilində şifahi və yazılı şəkildə düzgün ifadə etməkdə çətinlik çəkmirlərsə, təlimin müvəffəqiyyətlə həyata keçdiyi qənaətinə gəlmək olar. İbtidai siniflərdə şagirdlərə Azərbaycan dilinin fonetikası, leksikası, söz yaradıcılığı, qrammatikası ilə bağlı müəyyən həcmdə bilik və bacarıqlar vermək, dilin ictimai həyatdakı rolu haqqında anlayış yaratmaq zəruridir. Şagirdlərin düzgün tələffüz və oxu vərdişlərini, rabitəli nitqini inkişaf etdirmək, onlarda sözə, dilin ifadəlilik vasitələrinə, onun zənginliklərinə həssas münasibət və diqqətlə yanaşmaq meyli tərbiyə etmək daim müəllimin diqqət mərkəzində olmalıdır. Şagirdlərdə orfoqrafiya və durğu işarələri ilə bağlı möhkəm vərdişlər yaratmaq da vacib məsələlərdəndir. Azərbaycan dilinin öyrənilməsi şagirdlərin ünsiyyət imkanlarını genişləndirir, onlarda düşünmə, öyrənmə və danışma bacarıqlarını formalaşdırır. Nəticədə Azərbaycan dili düşünmə, öyrənmə, danışma vasitəsinə çevrilir.

Azərbaycan dili ümumtəhsil məktəblərində tədris olunmaqla şagirdlərdə nitq mədəniyyətinin formalaşmasına xidmət edir. Şagirdlər bu fənnin vasitəsilə milli mədəniyyət nümunəsi kimi ana dilini öyrənir, onun səs sisteminə, lüğət ehtiyatına, üslubi-qrammatik xüsusiyyətlərinə yaxından bələd olur, elmi, bədii, publisistik və digər üslublarda yaradılmış ədəbiyyat nümunələri ilə tanış olmaq imkanı qazanırlar. Eyni zamanda, bu dildən istifadə edərək öyrənəcəkləri digər fənlərin daha yaxşı mənimsənilmə potensialını genişləndirirlər. Hər bir şəxs müxtəlif formalı və məzmunlu mətnləri səlis, şüurlu oxumağa, yazılı və şifahi şəkildə səmərəli və yaradıcı ünsiyyət qurmağa qadir olmalıdır. Bu baxımdan, Azərbaycan dilinin bir fənn kimi təlim əhəmiyyəti çox böyükdür. Azərbaycan dili ümumtəhsil məktəblərində tədris olunmaqla şagirdlərdə nitq mədəniyyətinin formalaşmasına xidmət edir. Şagirdlər bu fənnin vasitəsilə milli mədəniyyət nümunəsi kimi ana dilini öyrənir, onun səs sisteminə, lüğət ehtiyatına,

üslubi-qrammatik xüsusiyyətlərinə yaxından bələd olur, elmi, bədii, publisistik və digər üslublarda yaradılmış ədəbiyyat nümunələri ilə tanış olmaq imkanı qazanırlar. Eyni zamanda, bu dildən istifadə edərək öyrənəcəkləri digər fənlərin daha yaxşı mənimsənilmə potensialını genişləndirirlər. Hər bir şəxs müxtəlif formalı və məzmunlu mətnləri səlis, şüurlu oxumağa, yazılı və şifahi şəkildə səmərəli və yaradıcı ünsiyyət qurmağa qadir olmalıdır. Bu baxımdan, Azərbaycan dilinin bir fənn kimi təlim əhəmiyyəti çox böyükdür.

Azərbaycan dili üzrə hər hansı anlayış, dil hadisəsi, qayda və tərif şagirdlərin şifahi və yazılı nitqinin inkişafına yönəlmişdir. İbtidai siniflərdə dil üzrə keçirilən hər bir dərs mahiyyət etibarilə nitq inkişafına xidmət edir, çünki ibtidai siniflərdə ana dili tədrisinin başlıca prinsipi nitq inkişafıdır. Odur ki, hər bir dərsdə nitq inkişafı üzrə müvafiq vərdişlərin aşlanması nəzərdə tutulur. Azərbaycan dili üzrə dərslər şagirdlərin savadlı yazıya yiyələnmələrinə, onların nitqinin, təfəkkürünün inkişafına kömək edir.

Nitq inkişafı üzrə aparılan işlərin məzmununa birinci növbədə şagirdin lüğət ehtiyatının zənginləşdirilməsi üzrə işlər daxildir. Lüğətin zənginliyi bir növ dilin, nitqin zənginliyi deməkdir. Professor Ə.Əfəndizadə, B.Əhmədov, Y.Kərimov, H.Balıyev, A.Rəhimov, N.Cəfərova və başqaları nitq inkişafı ilə bağlı yazdığı əsər və məqalələrdə şagirdlərin lüğət ehtiyatının zənginləşdirilməsi üçün səmərəli metodika işləyib hazırlamışlar. Ədəbi tələffüz normalarına əməl olunması şifahi nitqin əsas göstəricisidir. Ədəbi tələffüz üzrə prof. N.Abdullayev, prof. Ə.Əfəndizadə, dos. N.Əhmədov və başqaları tədqiqat işi aparmışlar. Təkcə lüğət ehtiyatının zənginliyi, müəyyən lüğət ehtiyatına malik olmaq, ədəbi tələffüz normalarına əməl etmək nitq üçün kifayət deyildir. Sözləri dilin qram-matik qaydalarına uyğun şəkildə birləşdirib cümlə düzəltdikdən sonra fikir ifadə olunur. Nitq inkişafının mühüm aspektlərindən biri olan cümlə üzrə iş xüsusi diqqət tələb edir. Nitq inkişafı üzrə aparlan işlərin əsas istiqamətlərindən biri də nitq üslubu üzrə işlərdir. Prof.H.Balıyev, prof. B.Əhmədov, dos.Ə.Kəlbəliyev və başaqaları öz əsərlərində üslubiyyatla bağlı faydalı fikirlər söyləmişlər. Nitq inkişafı üzrə işlərin yekunu və nəticəsi rabitəli nitqdir. Şagirdlərin fəal nitq fəaliyyətinin təşkili, düzgün tələffüzün mənimsənilməsi, lüğətin zənginləşdirilməsi, nitqin qrammatik quruluşuna əməl edilməsi və fikirləri rabitəli ifadə etmək rabitəli nitqin formalaşması deməkdir.

İbtidai siniflərdə ana dili ilə əlaqədar işlər iki istiqamətdə aparılır. Birinci və ikinci siniflərdə əsasən şagirdlər əlifbanı öyrənir, oxu və yazı texnikasına yiyələnirlər. Bu siniflərdə şagirdlərin düzgün, sürətli, süurlu və ifadəli oxuması xüsusi diqqət mərkəzində saxlanılır. III-IV siniflərdə isə müəllimlər oxu dərslərində şagirdlərə Azərbaycan dilinin dövlət dili olması, onun ahəngdarlığı, gözəlliyi, cazibədarlığı haqqında sadə, şagirdlərin anlaq səviyyəsinə uyğun məlumatlar verməklə olarda ana dilinə qarşı məhəbbət hissi yaratmağa başlayırlar. Təcrübəli müəllimlər nəzm əsərlərinin tədrisidə bu sahəyə geniş yer verirlər. Çünki şeirlərdə Azərbaycan dilinin füsünkar gözəlliyi daha qabarıq nəzərə çarpır. Digər tərəfdən ibtidai sinif şagirdləri şeir əzbərləməyi, şeir söyləməyi çox sevirlər. Müəllimlər şagirdlərin bu istəyindən istifadə edərək tez-tez müxtəlif müsabiqələr, disputlar, səhərciklər, səhnəciklər və s. keçirirlər ki, bunlar da şagirdlərin ana dilini daha yaxşı mənimsəmələri və onu sevmələri üçün çox böyük şərait yaratmış olur.

İbtidai siniflərdə hər bir şagird müxtəlif formalı və məzmunlu mətnləri səlis, şüurlu

oxumağı, yazılı və şifahi şəkildə səmərəli və yaradıcı ünsiyyət qurmağı bacarmalıdır. Bu baxımdan, Azərbaycan dilinin bir fənn kimi təlim əhəmiyyəti böyükdür. Şagirdlər Azərbaycan dili fənni vasitəsilə milli mədəniyyət nümunəsi kimi Azərbaycan dilini və onun vasitəsilə milli-mənəvi sərvətlərimizi öyrənir, əxlaqi dəyərlərə və yüksək insani keyfiyyətlərə yiyələnir, Azərbaycan dilindən istifadə etməklə digər fənləri daha yaxşı mənimsəyirlər.

Azərbaycan dili ibtidai siniflərdə təlim fənlərinin əsasıdır. Şagirdlər ana dilinə yiyələnmədən, onun incəliklərinə bələd olmadan digər fənlər üzrə proqram materiallarını müvəffəqiyyətlə mənimsəyə bilməzlər. Ana dili xarakteri etibarilə inteqrativ fəndir. Bu fənn lap başlanğıcından botanika, zoologiya, anatomiya, coğrafiya, fizika, kimya, tarix və digər fənlərin elementlərini özündə əks edir. Hər bir tədris fənni praktik şəkildə startı ana dili fənnindən götürür. Şagirdlərdə nitq mədəniyyətinin formalaşdırılmasında Ana dili fənni aparıcı mövqe tutur.

Ümumiyyətlə dil – o cümlədən də, Azərbaycan dili qüdrətli tərbiyə vasitəsidir. Şagirdlər onun vasitəsilə milli-mənəvi sərvətlərimizi öyrənir, əxlaqi dəyərlərə və yüksək insani keyfiyyətlərə yiyələnirlər. Şagird Azərbaycan dilini öyrənməklə öz zehnini yeni təsəvvürlər və surətlərlə, məfhum, fikir və ideyalarla zənginləşdirir. Mübariz, vətənpərvər, iradəli, milli mənlik şüuruna yiyələnən şəxsiyyət kimi formalaşmasının əsası qoyulur. Müşahidə və təcrübələr göstərir ki, məktəbdə bütün təlim və tərbiyə işlərinin müvəffəqiyyəti uşağın ana dili sahəsindəki uğurlu fəaliyyətindən çox asılıdır. Azərbaycan dili hər hansı bir məlumatı mənimsəmək üçün başlıca alətlərdən biridir. Uşaq hər şeyi öyrənməkdə və tərbiyə almaqda başlıca olaraq, sözdən istifadə etdiyi üçün dil bütün təlim və tərbiyə işlərinin mühüm vasitəsi kimi özünü göstərir.

Uşaqlar dil öyrənmə prosesinə dinləmə ilə başlayırlar. Dinləmə danışma, oxuma və yazma kimi proseslərdə baza rolunu oynayır. Dinləmə həm öyrənmə prosesinə, həm də zehni qabiliyyəti inkişaf etməyə təsir göstərir. Məktəbyaşlı uşaqlar (5-6 yaş) bir dəqiqədə danışdıqları sözlərin böyük miqdarını dinləmə bacarığına malikdirlər. Dinləyərək öyrənən uşaqlar bu bacarığı öyrənmə vasitəsi kimi istifadə edə bilərlər. Dinləmə bacarığını inkişaf etdirmək məqsədilə edilən bütün fəaliyyət növləri şagird obyektli olmalı və müəllim bu işə lazımı rəhbərliyi etməlidir. Məlumdur ki, ibtidai siniflərdə müxtəlif məzmunlu və müxtəlif janrlı materiallardan dinləmə mətni kimi istifadə edilir. Müəllim dinləmə mətnlərindən istifadə etdikdə bu proses vizual vasitələrlə dəstəkləndikdə şagirdlərin mətni anlaması daha da asanlaşır. Mətnin düzgün anlamlandırılması üçün ilk növbədə şagird oradakı bütün sözlərin mənalarını anlamalı, daha sonra bu anlamlar cümlələrdə bütövləşib, vahid mənzərəni ortaya çıxarmalıdır. Dinləmə bacarıqların formalaşdırılması dil təliminin başlıca mövqelərindən biridir.

Dinləmə şifahi nitqin qavranılması, beyində mənalandırılmasıdır. Məktəbə gələnə qədər şagirddə fiziki vərdiş şəklində mövcud olan bu bacarıq dərs şəraitində sistemli şəkildə inkiŞaf etdirilir. Hərflərin təliminə qədər və təlimi prosesində istənilən sözlü məlumat uşaqlara, əsasən, şifahi nitq yolu ilə çatdırılır, odur ki, 1-ci sinif şagirdində dinləmə bacarığının formalaşdırılması xüsusi əhəmiyyət kəsb edir. Buna vaxtaşırı dinləmə mətnləri üzrə iş aparmaqla nail olmaq mümkündür. Bu zaman müəllim

bəzi məqamları nəzərə almalıdır: Mətni səsləndirən müəllim elə yerdə dayanmalıdır ki, bütün uşaqlar onu görə bilsinlər. Mətn aramla və intonasiya ilə oxunmalıdır. Natiqin səsi sinfin hər bir guşəsində eşidilməlidir. Mətn çox uzun olmamalı, ən çoxu 2 dəqiqədən bir fasilə verilməlidir. Fasilələrdə verilən suallar uşaqların diqqətini mətn üzərində cəmləməli, onları mətnin davamına daha diqqətlə qulaq asmağa stimullaşdırmalıdır. şagirdlər hər an mətn üzrə sual verməyə həvəsləndirilməlidirlər. Müəllim mətndə səslənən hər hansı bir sözün uşaqlar üçün tanış olmadığını ehtimal edərsə, nitqə fasilə verməli və yeni sözün mənasını uşaqlarla birlikdə açıqlamalıdır. İlk günlərdən şagirdlərə dinləmə qaydalarını başa salmaq və onlara əməl olunmasına nəzarət etmək lazımdır. Şagirdlər öz yerlərində rahat olmalı, partaların üstündə və ümumiyyətlə, sinifdə onların diqqətini yayındıracaq heç bir şey olmamalıdır. Müəllim danışarkən (oxuyarkən) şagirdlər onun jest və mimikalarını izləməlidirlər. Şagird bilməlidir ki, şifahi nitq bitdikdən sonra o, nitqi dinlədiyini sübut etməlidir.

Nəticədə onu deyə bilərik ki, dinləmə kimi, danışma da şifahi nitq bacarığıdır. Lakin dinləmədən fərqli olaraq, danışma qavrama, anlama deyil, bildiklərini və düşündüklərini şifahi nitq vasitəsilə ifadə etmək bacarığıdır. Danışma bacarığının inkişafında üç mərhələni qeyd etmək olar:

1. Gördüyünü (Şəkil) sözlə təsvir etmək.
2. Dinlədiyini öz sözləri ilə təkrar etmək.
3. Düşündüyünü danışmaq (2, 175).

İbtidai təhsil pilləsində danışma bacarığının inkişafına şəkillərin təsvirindən başlamaq məqsədəuyğundur. Bunun üçün dərslikdə müxtəlif kompozisiyalı şəkillər verilmişdir. İlkin mərhələdə bu şəkillər ətrafında iş konkret suallar ətrafında getməlidir ("şəkildə nə görürsən?", "Oğlan nə edir?", "Top nə rəngdədir?" və s.). Daha sonra uşaqlar rabitəli nitq quraraq şəkli bütövlükdə təsvir edirlər. Sonrakı mərhələdə uşaqlar mətni dinləməklə yanaşı, həmin mətnə çəkilmiş illüstrasiyaları da izləyirlər. Düşündüyünü danışmaq şifahi nitq bacarığının inkişafında daha ali mərhələdir. Bunun üçün şagirdin mənəvi dəyərlər haqqında təsəvvürləri, müəyyən bilik dairəsi və kifayət qədər söz ehtiyatı olmalıdır. Bununla belə, bu bacarıq da ilk günlərdən formalaşdırılmalı və inkişaf etdirilməlidir. Danışma bacarığını inkişaf etdirmək üçün sinifdə müzakirələr zamanı hər bir şagirdin özünüifadəsi üçün dəstəkliyici şərait yaradılmalıdır. Bunun üçün aşağıdakılar tövsiyə olunur: Uşaqlara tez-tez "Sən olsaydın, nə edərdin?" sualı verilməlidir. Belə olduqda problem uşağın şəxsi müstəvisinə keçir və onda danışmaq həvəsi yaranır. Daha çox açıq tipli düşündürücü suallar verilməlidir. Bu suallar "Səncə..." sözü ilə başlasa, yaxşı olar. Hər bir uşaq hiss etməlidir ki, onun fikri ətrafdakılar üçün əhəmiyyətlidir. Hər bir şagirdin fikrinə, yanlış olsa belə, hörmətlə yanaşılmalıdır. Yanlış danışmaq yox, heç danışmamaq pislənməlidir. Verilən suallar müvafiq yaş qrupunun maraq dairəsinə yaxın olmalıdır. Suala cavab vermək üçün şagirdə fürsət, cəsarət və kifayət qədər vaxt verilməlidir.

***Rəyçi: prof. Ə.Tanrıverdiyev***

